QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Fevral 2015
02 (1066)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## "Kitabi-Dədə Qorqud"un alman dilində ilk tərcüməsi və nəşrinin 200 illiyinin qeyd edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2015-ci ildə Azərbaycan xalqının mədəni sərvətlər xəzinəsində müstəsna yer tutan və əsrlərdən bəri milli-mənəvi varlığın ayrılmaz tərkib hissəsinə çevrilən "Kitabi-Dədə Qorqud" abidəsinin alman şərqşünas alimi Fridrix fon Dits tərəfindən üzə çıxarılması, nəşr edilməsi və dünya elm aləminə tanıdılmasının 200 illiyi tamam olur.

Ötən müddət ərzində "Dədə Qorqud" dastanları ilə bağlı çox sayda araşdırmalar aparılmış və qorqudşünaslığın ayrıca sahə kimi formalaşdırılması istiqamətində mühüm addımlar atılmışdır. 2000-ci ildə "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin YUNESKO xətti ilə beynəlxalq səviyyədə təntənəli qeyd edilməsi abidənin tədqiqi tarixində yeni mərhələnin başlanğıcı olmuşdur.

Milli-mədəni irsin qorunub yaşadılması və yeni nəsillərin azərbaycançılıq ruhunda tərbiyə olunmasında "Dədə Qorqud" dastanlarının böyük əhəmiyyətini nəzərə alaraq, qorqudşünaslığın sistemli fəaliyyətinin təmin edilməsi məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Milli Elmlər Akademiyası ilə birlikdə, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin, Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun və Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, "Kitabi-Dədə Qorqud"un alman alimi Fridrix fon Dits tərəfindən ilk tərcüməsi, nəşri və dünya elm aləminə tanıdılmasının 200 illiyinə dair fəaliyyət proqramını hazırlayaraq təsdiq olunmaq üçün Azərbaycan Respublikasının Nazirlər Kabinetinə təqdim etsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 20 fevral 2015-ci il*

## Xocalı soyqırımı - tariximizin faciəli səhifəsi

### *ADPU-da Xocalı soyqırımının iyirmi üçüncü ildönümü ilə əlaqədar anım mərasimi keçirilib*

**Fevral ayının 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük zalında Tələbə Gənclər Təşkilatının (TGT) və universtitetdə təhsil alan Türkiyəli Tələbələrin İdarə Heyətinin təşəbbüsü ilə Xocalı soyqırımının iyirmi üçüncü ildönümü ilə əlaqədar anım mərasimi keçirilib. Anım mərasimində ilk olaraq Xocalı faciəsi qurbanlarının, həm də bütövlükdə Azərbaycanın və Türkiyənin azadlığı və ərazi bütövlüyü uğrunda şəhid olmuş soydaşlarımızın xatirələri bir dəqiqəlik sükutla yad edilib, hər iki ölkənin dövlət himnləri səsləndirilib.**




Anım mərasimində giriş nitqi ilə çıxış edən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov bildirib ki, bu günlər respublikamızda və dünyanın bir çox ölkələrində Xocalı soyqırımının iyirmi üçüncü ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik, hörmətli Ramiz Mehdiyevin imzaladığı müvafiq sərəncamla "Xocalı soyqırımının iyirmi üçüncü ildönümünün keçirilməsinə dair tədbirlər planı" təsdiq edilmişdir. Tədbirlər planında Bakı şəhərinin Xətai rayonunda, Goranboy rayon mərkəzində və Ağcakənd qəsəbəsində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ucaldılmış abidələrin önünə əklil qoyulması, mərasimlərinin keçirilməsi, Azərbaycanın xarici ölkələrdəki səfirliklərində, nümayəndəliklərində və diaspor təşkilatlarında bu soyqırımı ilə bağlı mətbuat konfranslarının, anım mərasimlərinin və digər tədbirlərin təşkili, xarici və yerli kütləvi informasiya vasitələrində, o cümlədən teleradio kanallarında, İnternet şəbəkəsində Xocalı soyqırımını əks etdirən materialların yayılması nəzərdə tutulmuşdur. Eyni zamanda həmin sənəddə ölkədə fəaliyyət göstərən dini konfessiya və qurumlar tərəfindən Xocalı soyqırımı qurbanlarının xatirəsinə həsr olunan anım mərasimlərinin təşkil edilməsi, idarə və təşkilatlarda, teatr-konsert müəssisələrində, sərgi salonlarında, ali və orta məktəblərdə xatirə gecələri, foto-rəsm sərgiləri, şahidlərlə görüşlərin keçirilməsi, milli azadlıq uğrunda mübarizəyə həsr olunan sənədli və bədii filmlərin nümayiş etdirilməsi öz əksini tapmışdır.

Faciənin iyirmi üçüncü ildönümü ilə əlaqədar rəsmi dövlət strukturları rəhbərlərinin, millət vəkillərinin və ziyalıların iştirakı ilə xocalıların müvəqqəti məskunlaşdıqları şəhər və rayonlarda-Bakı, Sumqayıt, Gəncə, Mingəçevir, Şəki, Goranboy, Bərdə, Sabirabad, Göyçay, Zaqatala, Oğuz və Balakən rayonlarında şəhid ailələrinə yardımlar ediləcəkdir. Təhsil müəssisələrində fevralın 26-da ilk dərslər bu faciəyə həsr olunacaq, həmin gün saat 17.00-da bütün ölkə ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad ediləcək, respublikamızın şəhər və rayonlarında, kənd və qəsəbələrində Azərbaycanın dövlət bayraqları endiriləcək.

Qeyd edim ki, Təhsil naziri cənab Mikayıl Cabbarov bu il fevral ayının 9-da təhsil müəssisələrində bəşər tarixinə XX əsrin ən dəhşətli faciələrindən biri kimi daxil olmuş Xocalı soyqırımının iyimi üçüncü ildönümünün keçirilməsi barədə müvafiq əmr imzalamışdır və həmin əmrə əsasən təhsil müəssisələrində keçiriləcək tədbirlər planı təsdiq edilmişdir.

Yuxarıda qeyd etdiyim sənədlərə əsasən ADPU-da fevralın 15-də imzalanmış müvafiq əmrə uyğun olaraq universitetdə Xocalı soyqırımının iyirmi üçüncü ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilib. Belə ki, 18-26 fevral tarixlərində universitetimizin bütün fakültələrində Xocalı soyqırımına həsr edilmiş fotostendlər yaradılıb, ədəbi-bədii gecələr, eyni zamanda soyqırımının şahidi olan insanlarla görüşlər keçirilib, azadlıq uğrunda mübarizəyə həsr olunmuş sənədli və bədii filmlər nümayiş etdirilib. Tələbə Gənclər Təşkilatı Kompüter Mərkəzi ilə birlikdə fevralın 23-də universitetin İnternet saytına Xocalı soyqırımını əks etdirən materiallar daxil etmişdir. Sabah universitetin bütün fakültələrində ilk dərs saatları Xocalı soyqırımına həsr ediləcək. Bizim bu gün Xocalı soyqırımının iyirmi üçüncü ildönümünə həsr etdiyimiz bu anım mərasimi də Xocalı faciəsi zamanı həlak olan soydaşlarımızın əziz və unudulmaz xatirəsinə olan böyük hörmət və ehtiramımızı özündə əks etdirir.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, 1992-ci il fevralın 25-dən 26-na keçən gecə Xocalıda baş vermiş dəhşətli faciədən iyirmi üç il ötür. Xocalı faciəsindən danışarkən bir qədər də həmin dövrün ictimai-siyasi və hərbi vəziyyətinin təhlili üzərində dayanmaq məqsədəuyğundur. Xocalı 1991-ci ilin may ayından blokada vəziyyətində yaşayırdı, yalnız telefon əlaqəsi var idi. Xocalının erməni hərbi birləşmələri tərəfindən mühasirəsi isə faktiki olaraq 1991-ci ilin oktyabrından başlanmışdı. Belə ki, Xankəndi ilə Əsgəran arasında strateji əhəmiyyətli yer sayılan Xocalının ələ keçirilməsi ermənilər üçün böyük əhəmiyyət kəsb edirdi. Elə buna görə də, düşmən öz canlı hərbi qüvvə və texnikasını Xocalı ətrafında cəmləşdirmişdi. Mühasirə şəraitində yaşayan və mübarizə aparan Xocalıya Bakıdan lazımi köməyin göstərilməməsi də bu rayonun sakinlərinin vəziyyətini çox çətinləşdirirdi. Həmin dövrdə Xocalı şəhəri əsasən atıcı silahlarla silahlanmış yerli könüllü dəstələr, milis və Milli Ordunun birləşmiş qüvvələri tərəfindən müdafiə olunurdu. Yalnız faciə ərəfəsində edilən çoxsaylı müraciətlərdən sonra



**(Davamı 2-ci səhifədə)**

## "Xocalı soyqırımının iyirmi üçüncü ildönümünün keçirilməsinə dair tədbirlər planı" təsdiq edilib

Azərbaycan Respublikası Prezidenti Administrasiyası rəhbərinin sərəncamı ilə "Xocalı soyqırımının iyirmi üçüncü ildönümünün keçirilməsinə dair tədbirlər planı" təsdiq edilib.

AzərTAc xəbər verir ki, tədbirlər planında Bakının Xətai rayonunda, Goranboy rayon mərkəzində və Ağcakənd qəsəbəsində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ucaldılmış abidələrin önünə əklil qoyulması mərasimlərinin keçirilməsi, Azərbaycan Respublikasının xarici ölkələrdəki səfirliklərində, nümayəndəliklərində və diaspor təşkilatlarında bu soyqırımı ilə bağlı tədbirlərin (mətbuat konfranslarının, anma mərasimlərinin və s. təşkili, xarici və yerli kütləvi informasiya vasitələri, o cümlədən teleradio kanallarında, internet şəbəkəsində Xocalı soyqırımına həsr olunan materialların yayılması nəzərdə tutulub.

Sənədə əsasən, ölkədə fəaliyyət göstərən dini konfessiya və qurumlar tərəfindən Xocalı soyqırımı qurbanlarının xatirəsinə həsr olunan anma mərasimləri təşkil ediləcək, idarə və təşkilatlarda, teatr-konsert müəssisələrində, sərgi salonlarında, ali və orta məktəblərdə xatirə gecələri, foto-rəsm sərgiləri, şahidlərlə görüşlər keçiriləcək, milli azadlıq uğrunda mübarizəyə həsr olunan sənədli və bədii filmlər nümayiş etdiriləcək.

Xocalıların müvəqqəti məskunlaşdıqları şəhər və rayonlarda (Bakı, Sumqayıt, Gəncə, Mingəçevir, Şəki, Goranboy, Bərdə, Sabirabad, Göyçay, Zaqatala, Oğuz, Balakən) dövlət qurumları rəhbərlərinin, Milli Məclisin deputatlarının və ziyalıların iştirakı ilə şəhid ailələrinə yardımlar göstəriləcək.

Fevralın 26-da təhsil müəssisələrində ilk dərslər bu faciəyə həsr olunacaq, həmin gün saat 17.00-da bütün ölkə ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad ediləcək, respublikanın şəhər və rayonlarında, kənd və qəsəbələrində Azərbaycanın dövlət bayraqları endiriləcək.

# Xocalı soyqırımı - tariximizin faciəli səhifəsi

(Əvvəli 1-ci səhifədə)

Bakıdan Xocalıya 16 nəfər hərbiçi göndərilmişdi. 1991-ci il oktyabrın 30-dan Xocalı ilə quru əlaqəsi kəsilmişdi. 1992-ci il yanvarın 2-dən sonra isə Xocalıya hətta, elektrik enerjisi belə verilmirdi. 1992-ci il yanvarın 28-də Ağdam-Şuşa reysi ilə uçan mülki vertolyotun vurulmasından sonra Xocalı ilə hava əlaqəsinə də son qoyuldu. Beləcə, Xocalı canlı qüvvə və silah-sursat sarıdan çox üstün olan düşmənlə mübarizədə tək qalmışdı. Xocalının




mühasirə həlqəsi günü-gündən daralırdı. Bakıya, mərkəzi hakimiyyətə kömək üçün edilən çoxsaylı müraciətlərə isə cavab verilmirdi

1992-ci ilin yanvarın sonu, fevralın əvvəlləri Kərkicahan, Quşçular, Malıbəyli və Qaradağlı kəndləri ermənilər tərəfindən işğal edildi. Bir müddət öncə-1992-ci il yanvarın 26-da Daşaltıda keçirilmiş uğursuz hərbi əməliyyat nəticəsində isə 90-dan çox döyüşçümüz həlak olmuş, onlarca əsgərimiz əsir götürülmüş, itkin düşmüşdü. Həmin dövrdə ölkə rəhbərliyində təmsil olunan şəxslər isə sanki bunu görmürdülər. Xocalının müdafiəsi üçün dövlət səviyyəsində zəruri əməli tədbirlərin həyata keçirilməməsi nəticə etibarilə bu faciəyə şərait yaratdı. Digər tərəfdən, ermənilərin Xocalı soyqırımını törətməsi nəticəsində Ermənistanın Azərbaycana qarşı başladığı hərbi əməliyyatlar Dağlıq Qarabağın hüdudlarından kənara çıxdı.

Xocalı faciəsi XX əsrdə ermənilər tərəfindən xalqımıza qarşı törədilmiş növbəti kütləvi qırğın olmaqla bərabər, həm də Azərbaycanın ərazi bütövlüyünə və dövlət müstəqilliyinə qarşı yönəlmiş ənənəvi terror siyasətinin tərkib hissəsidir. Bu soyqırımı həm də bəşəriyyətə və insanlığa qarşı yönəlmiş ən qəddar cinayətlərdən biridir. Xocalı soyqırımı sözün həqiqi mənasında beynəlxalq hərbi cinayət aktıdır. Beynəlxalq hüququn norma və prinsiplərinə əsla məhəl qoyulmadan həyata keçirilmiş bu soyqırımı aktı xalqımızın azadlıq və müstəqillik istəyini məhv etməyə yönəldilmişdi. Digər tərəfdən, Xocalı soyqırımı ermənilər tərəfindən burada törədilmiş birinci qətliam deyildi: mənfur ermənilər hələ 1906 və 1918-




ci illərdə bu şəhəri yandırıb külə döndərmiş, əhalisini isə qırıb məhv etmişdilər. Namərd və xain qonşularımız olan ermənilər keçmiş Sovet Ordusunun Xankəndidə yerləşən 366-cı motoatıcı alayının köməyi ilə 1992-ci il fevralın 25-dən 26-na keçən gecə 7 min əhalisi olan Xocalıda daha dəhşətli və daha qəddar bir cinayət törətdilər. Onu da qeyd edim ki, Xocalı soyqırımınadək bu rayonun Kərkicahan, Əsgəran rayonunun Qaradağlı, Qazax rayonunun Bağanıs Ayrım kəndləri də erməni vəhşiləri tərəfindən məhv edilmişdi.

Xocalı faciəsi bəşər tarixində misli görünməmiş bir cinayət aktıdır. Həmin o dəhşətli gecədə Xocalı şəhəri sakinləri ilə birgə tamamilə məhv edildi. Faciə zamanı 613 nəfər, o cümlədən 106 qadın, 63 uşaq, 70 qoca ermənilər tərəfindən xüsusi qəddarlıqla qətlə yetirildi, 1275 nəfər dinc sakin əsir götürüldü, 150 nəfər isə itkin düşdü, 8 ailənin həyatına son qoyuldu, 25 uşaq hər iki valideynindən, 130 uşaq isə valideynlərinin birindən məhrum oldu, 487 dinc sakin ağır yaralandı. Bu, İkinci Dünya müharibəsində faşizmin törətdiyi dəhşətli qırğınlardan sonra müasir dövrdə erməni separatçı-terrorçuları ilə birlikdə Ermənistan hərbi qüvvələrinin və Rusiyanın 366-cı motoatıcı alayının əsgərlərinin törətdiyi ən kütləvi və ən dəhşətli soyqırımıdır. Beynəlxalq qanunlara görə, hər hansı bir ərazi silahlı qüvvələr tərəfindən mühasirəyə alınarkən dinc mülki əhalinin həmin ərazidən çıxması üçün bir koridor qoyulur. Nankor və xain ermənilər də guya Xocalıda dinc əhalinin çıxması üçün koridor qoymuşdular, lakin həmin yola üz tutan xocalıları erməni hərbçiləri elə həmin yoldaca ya əsir götürür, ya da vəhşicəsinə qətlə yetirirdilər. Bir çox meyitlərin bədənləri süngü ilə deşik-deşik edilmiş, başlarının dərisi soyulmuş, gözləri çıxarılmış, burun və qulaqları kəsilmişdi. Xocalıda köməksiz uşaqlara qarşı törətdikləri vəhşilikləri ermənilər özləri də etiraf ediblər. 1996-cı ildə erməni yazıçısı Zori Balayanın müəllifliyi ilə işıq üzü görmüş "Ruhumuzun dirilməsi" adlı kitabın 260-262-ci səhifələrində yazılıb: "Mən və Xaçatur onların saxlandığı zirzəmiyə daxil olanda əsgərlərimiz artıq bir uşağı pəncərəyə hörmüşdülər. Onun çox səs-küy salmaması üçün ölmüş atasının dərisini qoparıb ağzına soxmuşdular. Sonra mən 13 yaşlı bir türkün baş, sinə və qarnından dərisini qopardım. Təxminən 7 dəqiqə sonra uşaq qan itkisindən öldü. Mən birinci dərəcəli həkim kimi humanistəm, ona görə də uşağın başına gətirdiyim zülmlərdən xoşbəxtlik hiss eləmirdim, lakin daxilən sevinirdim. Xaçatur uşağın cəsədini tikə-tikə doğradı və yem kimi itlərə atdı. Həmin axşam biz daha üç türk törəməsinin başına həmin oyunu açdıq. Mən patriot vətəndaş kimi erməni borcumu yerinə yetirirdim".

Xocalı hərbi cinayəti, Xocalı soyqırımı işğalçı Ermənistanın Azərbaycana qarşı hərbi təcavüzünün əsl mahiyyətini və erməni vəhşiliyinin dəhşətlərini bütün çılpaqlığı ilə üzə çıxardı. Bu dəhşətli hadisə həm də Azərbaycanın Qarabağ müharibəsində aldığı ən böyük zərbə idi. Bu ağır zərbənin və hərbi uğursuzluğun ən böyük səbəbləri isə təbii ki, həmin dövrdə Azərbaycanın rəhbərliyində təmsil olunan şəxslərin məsuliyyətsizliyi, səriştəsizliyi və ən başlıcası isə, xalqımızın milli maraqlarına xəyanət etmələri olmuşdur.

Təəssüf və qəzəbdoğuran bir fakt da ondan ibarət idi ki, Xocalıda baş vermiş hadisə terror aktı olsa da, həmin dövrdə Azərbaycanın rəhbərliyində təmsil olunan şəxslərin məsuliyyətsizliyi üzündən erməni vandalizminin əsl mahiyyəti dünya ictimaiyyətinə olduğu kimi çatdırılmadı. Televiziyada və rəsmi mətbuatda düşünülmüş şəkildə guya Xocalıda cəmi 2 nəfərin öldürüldüyü bildirildi və bununla da milli maraqlarımıza böyük zərbə vurularaq, soyqırımı faktının miqyası kiçildildi. Düşmən tərəfi isə Xocalıda törətdikləri vəhşilikləri dünya ictimaiyyətinə "cəza aktı" kimi təqdim etdi.

Xocalı soyqırımının beynəlxalq ictimaiyyətə çatdırılması ilə bağlı əməli tədbirlər yalnız ulu öndərimiz Heydər Əliyevin xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə Azərbaycanda yenidən dövlət rəhbərliyinə qayıtmasından sonra həyata keçirildi. Məhz ümummilli liderimiz Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra işğalçı Ermənistanın Azərbaycana qarşı həyata keçirdiyi soyqırımı və terror siyasətinin mahiyyətini özündə dolğun əks etdirən faktların dünya ictimaiyyətinə çatdırılmasını müstəqil dövlətimizin xarici siyasətinin ən mühüm vəzifələrindən biri kimi müəyyənləşdirdi və bu vacib istiqamətdə səmərəli əməli tədbirlər həyata keçirdi. Bu məqsədlə atılan addımlardan biri isə Xocalı faciəsinə siyasi-hüquqi qiymətin verilməsi oldu. Xalqımızın dahi lideri Heydər Əliyevin təşəbbüsü ilə 1994-cü il fevralın 24-də Milli Məclisdə «Xocalı Soyqırımı Günü haqqında» qərar qəbul edildi, BMT-yə və dünyanın aparıcı dövlətlərinə bu faciənin mahiyyətini açıqlayan və beynəlxalq ictimaiyyəti erməni terrorçuluğuna qarşı təsirli tədbirlər görməyə çağıran müraciət ünvanlandı. Ulu öndərimiz Heydər Əliyev «Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi edilməsi haqqında» 25 fevral 1997-ci il tarixli müvafiq sərəncam imzalamışdır ki, bu sərəncama əsasən hər il fevralın 26-sı saat 17.00-da Azərbaycan Respublikasının ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ehtiram əlaməti olaraq sükut dəqiqəsi elan edilir.

Xocalı faciəsi zamanı həlak olmuş soydaşlarımızın ailələləri hər bir zaman Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin diqqət mərkəzindədir. Respublikamızın 48 rayonunda məskunlaşmış xocalılara dövlət səviyyəsində hər cür qayğı və köməklik göstərilir. Bir faktı xüsusi qeyd etmək istəyirəm ki, son illər Xocalı faciəsinin beynəlxalq miqyasda tanınması istiqamətində bir sıra uğurlu addımlar atılmışdır. Xatırlatmaq istəyirəm ki, Azərbaycan Prezidenti cənab İlham Əliyev 2012-ci il yanvar ayının 17-də Xocalı soyqırımının iyirminci ildönümü haqqında sərəncam imzaladı və həmin sərəncama uyğun olaraq Xocalı soyqırımı ölkəmizdə dövlət səviyyəsində keçirildi. Həmin il fevral ayının 26-da xalqımız dövlət başçımız cənab İlham Əliyevin rəhbərliyi ilə Bakıda Xocalı faciəsinin iyirminci ildönümü ilə əlaqədar möhtəşəm bir yürüş keçirdi ki, bu da dünya ictimaiyyətinin diqqətinin yenidən Xocalı soyqırımına yönəltdi. Bundan başqa, dövlət başçımız cənab İlham Əliyev 2014-cü il fevral ayının 13-də "Xocalıya ədalət!" beynəlxalq kampaniyasının keçirilməsi ilə bağlı tədbirlər haqqında sərəncam imzalamışdır. Həmin sərəncama əsasən beynəlxalq səviyyədə keçirilən "Xocalıya ədalət!" kampaniyasının əhəmiyyəti nəzərə alınaraq ötən ilin dövlət büdcəsində nəzərdə tutulmuş Azərbaycan Respublikası Prezidentinin Ehtiyat Fondundan Gənclər və İdman Nazirliyinə 1 milyon manat vəsait ayrılmışdı.

Bu il də Xocalı faciəsi ilə əlaqədar dünyanın bir çox ölkələrində müxtəlif tədbirlər - konfranslar, dəyirmi masalar, elmi forumlar, etiraz aksiyaları və digər tədbirlər həyata keçirilir və belə tədbirlərin gələcəkdə də davam etdirilməsi nəzərdə tutulur. Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, Yeni Azərbaycan Partiyasının Sədr müavini Mehriban Əliyeva bütövlükdə Azərbaycan həqiqətləri, o cümlədən Xocalı faciəsi haqqında beynəlxalq ictimaiyyətin lazımi səviyyədə məlumatlandırılması üçün səmərəli əməli fəaliyyət göstərir. Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın təşəbbüsü ilə artıq yeddi ildir ki, beynəlxalq miqyasda «Xocalıya ədalət!» kampaniyası həyata keçirilir. Hazırda Xocalı faciəsinin mənəvi və siyasi-hüquqi səviyyədə tanınmasına yönəlmiş bu kampaniya dünyanın bir çox ölkələrində uğurla gerçəkləşdirilir. Artıq ABŞ-ın 23 ştatında Xocalı faciəsi tanınıb. Yeri gəlmişkən, qeyd edim ki, Xocalı soyqırımının iyirmi üçüncü ildönümü ilə əlaqədar Azərbaycanın xaricdəki diaspor təşkilatları geniş fəaliyyətə başlayıb. Belə ki, Avropanın bir çox şəhərlərinin mərkəzi küçə və meydanlarında etiraz aksiyaları keçirilir, bəzi şəhərlərdə ictimai nəqliyyat vasitələrində Xocalı soyqırımını əks etdirən videoçarxlar nümayiş olunur, küçə yürüşləri keçirilir. BMT-nin ABŞ-ın Nyu-York şəhərində yerləşən mənzil-qərargahı qarşısında, eləcə də təcavüzkar Ermənistanın Vaşinqton şəhərində yerləşən səfirliyi qarşısında etiraz aksiyası keçiriləcək, bundan başqa, ABŞ-ın müxtəlif ştatalarında yerli və xarici gənclərin iştirakı ilə disputların, dəyirmi masaların və digər tədbirlərin keçirilməsi nəzərdə tutulur. Bu il də fevral ayı Ukraynada «Xocalı ayı» elan edilib və ukraynalı gənclərin, ziyalıların, ictimai xadimlərin də fəal iştirakı ilə bu ölkənin bir çox şəhərlərində müxtəlif tədbirlər gerçəkləşdirilir. Eyni zamanda dünyanın bir çox ölkələrində, o cümlədən Türkiyə, Gürcüstan, Rusiya, Böyük Britaniya, Almaniya, Polşa, Rumıniya, Kanada, Belçika və digər ölkələrdə Xocalı soyqırımının iyirmi üçüncü ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Bu baxımdan, qardaş Türkiyə Azərbaycana böyük siyasi və mənəvi dəstək verir. Artıq Türkiyənin bir çox mərkəzi şəhərlərində Xocalı soyqırımının iyirmi üçüncü ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilib və həmin tədbirlər davam etdirilir. Bu ilin aprel ayında Türkiyə həm də Çanaqqala savaşının yüz illiyini dövlət səviyyəsində qeyd edəcək. Düşünürəm ki, bu, qondarma "erməni soyqırımı" tərəfdarlarına layiqli və tutarlı bir cavabdır.

Bütün bunlarla yanaşı, ölkə parlamenti də mütəmadi olaraq Xocalı soyqırımı ilə əlaqədar xüsusi iclaslar keçirir və müvafiq bəyanatlar qəbul edir. Həmin bəyanatlarda birmənalı şəkildə bildirilir ki, müstəqil Azərbaycan dövləti mövcud imkanlardan maksimum yararlanaraq, ərazi bütövlüyümüzü təmin edəcək, Xocalı faciəsinin əsl beynəlxalq hüquqi-siyasi qiymət almasına, onun ideoloqlarının, təşkilatçılarının və icraçılarının cəzalandırılmasına nail olacaqdır. Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkili (Ombudsman) hər il Xocalı soyqırımı ilə bağlı bəyanatlar verir və dünya ictimaiyyətinə müraciətlər ünvanlayır. Həmçinin Diasporla İş üzrə Dövlət Komitəsi və ölkəmizin vətəndaş cəmiyyəti institutlarının təmsilçiləri-qeyri-hökumət təşkilatlarının, ictimai birliklərin nümayəndələri Xocalı faciəsi ilə bağlı dünya ictimaiyyətinə mütəmadi məlumatlar verirlər. Paytaxtın Xətai rayonunda Xocalı qurbanlarının xatirəsini əbədiləşdirən abidənin ucaldılması da faciə zamanı həlak olmuş soydaşlarımızın ruhuna hörmət və ehtiramı özündə əks etdirir.

Rektor Y.Məmmədov çıxışının sonunda demişdir: "Baxmayaraq ki, təcavüzkar Ermənistanla 1994-cü ilin may ayının 12-də atəşkəs haqqında rəsmi razılıq əldə edilib, lakin tarixi düşmənimiz olan, xalqımıza, millətimizə qarşı Xocalı kimi insanlığa zidd bir soyqırımını törətmiş ermənilər bu gün də ölkəmizə qarşı faktiki olaraq hərbi əməliyyatları davam et-




dirir, sərhədyanı bölgələrdə daim atəşkəsi pozurlar. Birləşmiş Millətlər Təşkilatı Təhlükəsizlik Şurasının münaqişənin qeyd-şərtsiz həllinə dair 822, 853, 874, 884 saylı qətnamələri, eləcə də Avropa Şurası Parlament Assambleyasının və Avropa Təhlükəsizlik və Əməkdaşlıq Təşkilatının münaqişə ilə bağlı müvafiq qərarları bugünədək icra edilməyib. Bəzi beynəlxalq təşkilatlar nəinki bunu görmür, hətta Xocalını soyqırımı kimi tanımaq istəmirlər. Azərbaycan Prezidenti cənab İlham Əliyevin Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həlli ilə bağlı qətiyyətli mövqeyi belədir: Azərbaycan öz ərazisində ikinci bir erməni dövləti yaradılmasına əsla imkan verməyəcəkdir! Münaqişə beynəlxalq hüququn norma və prinsipləri əsasında, xalqımızın milli maraqlarına uyğun şəkildə öz ədalətli həllini tapmalıdır".

Rektor Y.Məmmədov çıxışının sonunda bu gün dəvəti qəbul edib anım mərasimində iştirak etdiklərinə görə Türkiyə Respublikasının Azərbaycandakı Təhsil müşaviri cənab Abdulqafar Böyükfırata, Pakistan Respublikasının Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Xalid Usman Qaisera, Sudan Respublikasının Azərbaycandakı səfirliyinin səlahiyyətli naziri cənab Məhəmməd Əl-Ballaya öz təşəkkürünü bildirib. Rektor eyni zamanda Xocalı soyqırımının iyirmi üçüncü ildönümünə həsr edilmiş tədbirin təşkil edilməsində fəallıq göstərdiklərinə görə Tələbə Gənclər Təşkilatına və Türkiyəli Tələblərin İdarə Heyətinə öz minnətdarlığını ifadə edib.

Anım mərasimində çıxış edən Səbail Rayon İcra Hakimiyyəti başçısının müavini




Eldar Ağayev, Türkiyə Respublikasının Azərbaycandakı Təhsil müşaviri cənab Abdulqafar Böyükfırat, Pakistan Respublikasının Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri cənab Xalid Usman Qaiser, Sudan Respublikasının Azərbaycandakı səfirliyinin səlahiyyətli naziri cənab Məhəmməd Əl-Balla çıxış edərək Xocalı faciəsini bütövlükdə bəşəriyyətə və insanlığa qarşı yönəlmiş ən qəddar cinayətlərdən biri kimi səciyyələndirmiş, dünya ictimaiyyətini bu faciəni soyqırımı kimi tanımağa çağırmışlar. Onlar təmsil etdikləri ölkələrin həmişə Azərbaycanın haqq səsinə səs verəcəklərini və ölkəmizin ərazi bütövlüyünü dəstəkləyəcəyini bildirmişlər.

Anım mərasimində Xocalı soyqırımını əks etdirən videoçarx nümayiş olunmuş, azərbaycanlı və türkiyəli tələbələr şeirlər söyləmiş, xalq mahnımız olan "Sarı gəlin" ifa edilmişdir.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

# Elmi Şuranın iclasında

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının fevral ayının 12-də keçirilən iclasının gündəliyində dörd məsələ dururdu: "2014-cü ildə ADPU-nun professor-müəllim heyətinin apardığı elmi-tədqiqat işləri barədə" universitetin Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyevin hesabatı, "2014-cü ildə fəlsəfə doktoru və elmlər doktoru proqramları üzrə doktoranturaya və dissertanturaya qəbulun nəticələri barədə" Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramovun məlumatı, cari məsələlər və seçkilər.

İclası giriş sözü ilə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, universitet Elmi Şurasının sədri, professor Yusif Məmmədov açmış, Təhsil Nazirliyinin (TN) kollegiya iclasının müvafiq qərarına əsasən ADPU-da da qeydiyyat, qiymətləndirmə və monitorinq qurumlarının yaradılması istiqamətində işlərin aparıldığı barədə Elmi Şura üzvlərini məlumatlandırmışdır.

Daha sonra Elmi Şura Əcnəbi tələbələrin işi üzrə fakültənin və Əcnəbi tələbələr üçün hazırlıq şöbəsinin ləğv edilib Beynəlxalq əlaqələr üzrə prorektorluğun strukturunda Əcnəbi tələbələrlə iş üzrə şöbə kimi fəaliyyətini davam etdirməsi, İqtisadi və sosial fənlər kafedrasının Fəlsəfə kafedrasına birləşdirilərək Fəlsəfə və sosial fənlər kafedrası adlandırılması, Nəzəri fizika kafedrasının dərs yükünün Elektrik və optika, həmçinin Fizikanın tədrisi metodikası və Mexanika və molekulyar fizika kafedraları arasında bölüşdürülməsi haqqında qərar qəbul etmişdir. Eyni zamanda Elmi Şurada universitet əməkdaşlarının aylıq əmək haqlarının mart ayının 1-dən artırılması barədə qərar qəbul edilmişdir.

***

Elmi Şurada "İlin müəllimi" nominasiyası üzrə qaliblər də elan edilmişdir. Dəqiq elmlər üzrə I və II yer müəyyənləşdirilməmiş, Riyazi analiz kafedrasının dosenti Vaqif Məstəliyev (167 bal) və Ümumi texniki fənlər kafedrasının baş müəllimi Ədalət Quliyev (165 bal) III yerə layiq görülmüşlər. Humanitar elmlər üzrə isə I yer müəyyənləşdirilməmişdir. Azərbaycan ədəbiyyatı tarixi kafedrasının dosenti Yaqub Babayev (272 bal) II yer, Azərbaycan dilçiliyi kafedrasının dosenti Həcər Hüseynova (197 bal) və Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mübariz Əmirov (191,5 bal) III yerə layiq görülmüşlər.

***

ADPU 2014-cü ili hansı elmi uğurlarla başa vurmuşdur?

"2014-cü ildə ADPU-nun professor-müəllim heyətinin apardığı elmi-tədqiqat işləri haqqında" hesabatla çıxış edən universitetin Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyevin məruzəsində bu məsələlər başlıca yer tutmuşdur. Professor V.Əliyevin məruzəsindən məlum olmuşdur ki, ADPU-nun 706 nəfər professor-müəllim heyəti hesabat dövründə 78 problem, 449 mövzuda elmi-tədqiqat işlərini uğurla həyata keçirmiş, 52 iş tədris prosesinə tətbiq edilmişdir. Aparılan elmi-tədqiqat işlərinin nəticələri 30 monoqrafiya, 37 dərslik, 76 dərs vəsaiti, 342 metodik vəsait, 880 məqalə şəklində işıq üzü görmüşdür. Qeyd olunan məqalələrdən 593-ü respublika, 287-si xarici ölkə mətbuatında dərc olunmuşdur. Bu sıraya 187 tezisin də mətbuat səhifələrinə çıxarıldığını qeyd etmək lazımdır ki, onlardan 150-si respublika, 37-ci isə xarici ölkə mətbuatında çap olunmuşdur.





Hesabat dövründə universitet əməkdaşlarından 2 nəfərinin beynəlxalq, 8 nəfərinin isə respublika elmi-praktik konfransında çıxışları olmuş, universitet tələbələrinin 12 elmi konfransı keçirilmişdir.

2014-cü il həmçinin universitet əməkdaşlarının yaddaşında 5 nəfərin elmlər doktoru, 9 nəfərin fəlsəfə doktoru dissertasiyaları müdafiə etmələri, 2 nəfərin professor, 5 nəfərin dosent diplomuna layiq görülmələri ilə yaddaqalan olmuşdur.

Fərqlənən alimlər sırasında Riyaziyyat fakültəsindən professor V.Qurbanovun, dosentlər Ə.Pələngovla R.Abbasovun, Fizika fakültəsindən professorlar M.Murquzov, E.Eyvazov və Ş.Əlizadənin, dosentlərdən C.Hüseynov, R.Abdurrazaqov, N.Niftiyev və İ.İsmayılovun, Kimya fakültəsindən professor Ə.Qurbanov və N.Verdizadə ilə dosentlərdən N.Əkbərov, K.Quliyev və M.Mirzəyevanın, Filologiya fakültəsindən professorlardan B.Xəlilov, N.Xudiyev, T.Novruzov, R.Qafarov, Z.Xəlilov və dosent M.Hüseynovun, Pedaqoji fakültədən professorlar F.Rüstəmovla M.Dadaşovanın, Coğrafiya və gənclərin çağırışaqədər hazırlığı fakültəsindən professor R.Sultanovun, elmlər doktoru M.Abduyevin, dosent M.Məmmədovun, baş müəllim M.Verdiyevanın, Tarix fakültəsindən professor M.Əmirov ilə dosent S.Seyidova və fəlsəfə doktoru S.Mustafayevanın, Biologiya fakültəsindən professor Ə.Fərəcov və dosentlər H.Hacıyeva ilə T.Abdullayevanın, Pedaqogika və psixologiya fakültəsindən professor R.Əliyev, dosent A.Məmmədov və fəlsəfə doktoru S.Əliyeva ilə baş müəllim N.Hüseynovanın adlarını qürurla çəkmiş, onların xarici və ölkə mətbuatında məqalələr dərc etdirdikləri barədə Elmi Şura üzvlərini məlumatlandırmışdır.

Məruzədə hesabat dövründə dövlət strukturları, təhsil müəssisələri, alim və mütəxəssislər qarşısında qoyulan vəzifələr, bu vəzifələrin icrası üçün Azərbaycanda həyata keçirilən dövlət proqramları, elmi hissənin fəaliyyət istiqamətləri, ADPU-da icra olunan elmi-tədqiqat işləri, fərqlənən alimlər, elmi-pedaqoji kadrların hazırlanması, elmi-pedaqoji kadrların attestasiyası, fəlsəfə doktoru proqramı üzrə doktorantura, elmlər doktoru və fəlsəfə doktoru proqramları üzrə dissertantura, elmi dərəcə və elmi ad alan əməkdaşlar, elmi-tədqiqat laboratoriyalarının (ETL) fəaliyyətinin nəticələri, TEC-in fəaliyyəti, kitab fondu, kitabxanaya daxil olmuş kitablar, oxuculara verilmiş kitab və digər çap məhsulları haqqında dolğun və hərtərfli məlumat verilmişdir. Qeyd olunmuşdur ki, ADPU-nun elmi strukturları öz fəaliyyətlərini elmi-tədqiqat işlərinin müasir standartlar səviyyəsində aparılması, elmi-tədqiqatların zəruri standart və problemlərinin müəyyənləşdirilməsi, ölkənin elmi kadr potensialının artırılması məqsədilə onun sosial müdafiəsinin gücləndirilməsi, elmin inkişafı üzrə milli strategiyanın müəyyənləşdirilməsi və həyata keçirilməsi, Azərbaycan elminin beynəlxalq elm məkanına inteqrasiyasının təmin olunmasının gücləndirilməsi istiqamətində qurmuşlar. Bu vəzifələrin icrası zamanı "Azərbaycan Respublikasında 2009-2015-ci illərdə elmin inkişafı üzrə Milli Strategiyanın həyata keçirilməsi ilə bağlı Dövlət Proqramı", "2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı" və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" əsas götürülmüşdür.

Professor V.Əliyev Elmi hissənin fəaliyyət istiqamətlərinin kafedralarda aparılan elmi-tədqiqat işlərinə nəzarətdən, Müdafiə Şurası və elmi-nəzəri seminarların, beynəlxalq və respublika konfranslarının keçirilməsinin, eləcə də xarici ölkə universitetləri ilə əlaqələrin təşkilindən, elmi-tədqiqat laboratoriyalarına və nəşriyyat şöbəsinin fəaliyyətinə nəzarətdən ibarət olduğunu söyləmiş, müvafiq strukturları öz fəaliyyətlərini daha da canlandırmağa çağırmışdır.

Professor V.Əliyev məruzəsinin sonunda universitetdə elmi-tədqiqat işlərinin səviyyəsinin daha da yüksəldilməsi üçün təkliflərlə çıxış etmişdir.

***

"2014-cü ildə fəlsəfə doktoru və elmlər doktoru proqramları üzrə doktoranturaya və dissertanturaya qəbulun nəticələri" barədə məlumat verən Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramovun çıxışından məlum olmuşdur ki, fəlsəfə doktoru proqramı üzrə 13 ixtisas üzrə doktoranturaya 16 nəfər, dissertanturaya 3 ixtisas üzrə 5 nəfər, elmlər doktoru proqramı üzrə dissertanturaya 5 ixtisas üzrə 5 nəfər qəbul edilmişdir.

Sonda pedaqoji təcrübənin təşkili ilə əlaqədar Filologiya fakültəsinin Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti Şəlalə Nəbiyeva və Xarici dillər kafedrasının baş müəllimi Taisa Quliyeva haqqında təcrübə keçdikləri məktəblərdən, həmçinin Pedaqogika və psixologiya fakültəsinin III kurs tələbəsi Bikəxanım Bağırzadənin "Milli Debat" proqramı üzrə yüksək nəticə göstərməsi və tələbələrimizin bu forumda fəal iştirakları ilə əlaqədar "Vətəndaş Cəmiyyətində Debat" İctimai Birliyindən universitetin rəhbərliyinə ünvanlanmış təşəkkür məktubları oxunmuş, seçkilər keçirilmişdir.

**A.İSGƏNDƏROV**

# Yazıçı-publisist Nizami Muradoğlu ilə görüş

Fevral ayının 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin təşkilatçılığı ilə universitetdə AMEA-nın Folklor İnstitutunun "Yazılı ədəbiyyat və folklor şöbəsi"nin böyük elmi işçisi, Filologiya üzrə fəlsəfə doktoru, yazıçı-publisist, şair Nizami Muradoğlunun "Baba ocağı" kitabının təqdimatı və müzakirəsi keçirilib. Məlumat üçün onu da qeyd edək ki, yazıçı-publisist Nizami Muradoğlu "Baba ocağı" romanı ilə yanaşı, həm də "Qayıda bilmirəm", "Dayan, əsən külək", "Yaşayan Cavidlər", "Sözün Məmməd Araz zirvəsi" və digər kitablarıın müəllifi kimi də oxuculara yaxşı tanışdır.



Tədbiri giriş sözü ilə açan ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov bu görüşün keçirilməsində əsas məqsədin tələbə-gənclərlə yazıçı arasında canlı ünsiyyətin qurulmasının olduğunu bildirib. Professor B.Xəlilov qeyd edib ki, belə görüşlər gənc nəslin təlim-tərbiyəsində, vətəndaş kimi formalaşmasında mühüm rol oynayır. N.Muradoğlunun müəllifi olduğu "Baba ocağı" kimi bədii əsərlərə hər zaman ehtiyac olduğunu vurğulayan professor B.Xəlilov bildirib ki, bu romanda son yüzilliklərdə mənfur qonşularımız olan ermənilərin bizə qarşı həyata keçirdikləri xəbis və çirkin əməllər bədii dillə təsvir olunmuşdur. Romanda Ordubad rayonunun Əylis kəndində XX əsrin əvvəllərində xain və nankor ermənilərin Azərbaycan türklərinə qarşı törətdikləri xəyanətkarlıqlardan bəhs edilir, onların əsl simaları yüksək bədii ustalıqla oxucuya çatdırılır.

Müzakirələrin gedişində fəal iştirak edən Filologiya fakültəsinin tələbələri - 306-cı qrup tələbəsi Səbinə Rəcəbova, 308-ci qrup tələbəsi Könül Hüseynova, 309-cu qrup tələbəsi Gültəkin Behbudzadə, 101-ci qrup tələbəsi Nərgiz Qarayeva, 102-ci qrup tələbəsi Cəmilə Məhərrəmova və başqaları roman haqqında oxucu kimi öz fikir və təəssüratlarını bölüşüblər. Tələbə-gənclər əsərin yüksək mənəvi-tarixi əhəmiyyət daşıdığını söyləməklə yanaşı, belə əsərlərin milli yaddaşımızın qorunmasındakı əhəmiyyətini vurğulayıblar. Kitabın müəllifi Nizami Muradoğlu ADPU-nun rəhbərliyinə, həmçinin Filologiya fakültəsinin rəhbərliyinə, oxucularına, tədbirin iştirakçılarına minnətdarlığını bildirməklə yanaşı, onların çoxsaylı suallarını da cavablandırıb.

Tədbirdə çıxış edən ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev tələbələrin, bütövlükdə gənclərin bu məzmunlu əsərlərlə tanışlığını yüksək qiymətləndirib. Professor V.Əliyev yazıçının sözügedən romanının tarixi həqiqətlərin ifadəsi baxımından mühüm qaynaq olduğunu vurğulayıb.

Görüşdə çıxış edən AMEA-nın Folklor İnstitutunun "Yazılı ədəbiyyat və folklor şöbəsi"nin müdiri, filologiya üzrə elmlər doktoru, professor Kamran Əliyev, ADPU-nun Azərbaycan ədəbiyyatı tarixi kafedrasının müdiri, professor Himalay Qasımov və Əməkdar müəllim, tanınmış şair Oqtay Rza "Baba ocağı" kitabını gənclərimizin vətənpərvər və milli ruhda tərbiyə olunmasına müsbət təsir göstərən bir əsər kimi səciyyələndiriblər.

Tədbirə yekun vuran Filologiya fakültəsinin dekanı, professor B.Xəlilov belə görüşlərin gələcəkdə də keçiriləcəyini bildirib və tələbə-gəncləri fəal olmağa çağırıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Gülnar BƏXTİYARQIZI**



# Xalq yazıçısı Çingiz Abdullayev ilə görüş

**Fevral ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşəbbüsü ilə universitetdə xalqımızın dünya şöhrətli siyasi detektiv yazıçısı, nasir, publisist, hüquq elmləri doktoru, Azərbaycan Yazıçılar Birliyinin katibi, Xalq yazıçısı Çingiz Abdullayevlə görüş keçirilib. Görüşdə universitetin rəhbərliyi, professor-müəllim heyəti və tələbəgəncləri iştirak edib.**

Görüşü ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov açaraq Xalq yazıçısı Çingiz Abdullayevi salamlayıb və bildirib ki, bu, Pedaqoji Universitetdə Çingiz müəllimlə keçirilən sayca ikinci görüşdür. ADPU-da Çingiz müəllimlə belə bir görüş 2012-ci ilin mart ayında keçirilib. Görüşdən məmnunluğunu ifadə edən rektor Y.Məmmədov bütün dünyada tanınan Ç.Abdullayevi səmərəli və məhsuldar fəaliyyət göstərən qələm sahibi kimi səciyyələndirib.

Rektor Y.Məmmədov eyni zamanda bu görüşün keçirilməsi üçün dəvəti qəbul etdiyinə görə həm Ç.Abdullayevə, həm də görüşün təşəbbüskarı olan Tələbə Gənclər Təşkilatına (TGT) öz təşəkkürünü bildirib və tələbəgəncləri yazıçı ilə görüşdə fəal olmağa çağırıb.

Rektor Y.Məmmədov öz giriş sözündə məşhur yazıçının həyat və yaradıcılığı haqqında məlumat verərək bildirib ki, xalqımızın görkəmli yazıçısı Çingiz Akif oğlu Abdullayev 1959 -cu il aprel ayının 7-də Bakı şəhərində hüquqşünas ailəsində anadan olmuşdur. Atası Akif Abdullayev Böyük Vətən müharibəsinin iştirakçısı olmuş, Naxçıvan Muxtar Respublikasında prokuror, Bakı şəhərində prokuror müavini, Azərbaycan Vəkillər Kollegiyası Rəyasət Heyətinin sədri vəzifələrində çalışmışdır. Çingiz Abdullayev 1976-cı ildə Bakı şəhər 189 nömrəli tam orta məktəbi, 1981-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU-nun) Hüquq fakültəsini bitirmişdir. Əmək fəaliyyətinə 1981-ci ildə Bakı İstehsalat Birliyində hüquq məsləhətçisi kimi başlamış, bu müəssisədə böyük hüquq məsləhətçisi və şöbə rəisi işləmişdir. 1984-1986-cı illərdə Afrika, Asiya və Avropa ölkələrində ezamiyyətdə olmuş, sonrakı illərdə Bakı şəhəri Əzizbəyov Rayon İcraiyyə Komitəsində (indiki Xəzər rayonu) şöbə müdiri, Azərbaycan SSR KP MK-nın Qaradağ rayon komitəsində təşkilat şöbəsinin təlimatçısı, siyasi-maarif kabinetinin müdiri vəzifələrində çalışmışdır.

O, eyni zamanda elmi-tədqiqatla məşğul olmuş, 1988-ci ildə beynəlxalq təcavüz problemi barədə namizədlik dissertasiyası müdafiə edərək hüquq elmləri namizədi alimlik dərəcəsi, 1991-ci ildə isə beynəlxalq cinayət problemi haqqında doktorluq dissertasiyası müdafiə edərək hüquq elmləri doktoru alimlik dərəcəsi almışdır. Polşanın Krakov Universitetinin fəxri professorudur (1989). 1990-cı ildən H.Z.Tağıyev adına Xeyriyyə Cəmiyyətinin sədri, Azərbaycan Demokratik Ziyalılar İttifaqı nəzdində fəaliyyət göstərən Milli Akademiyanın doktoru və Azərbaycan "PEN" klubunun prezidentidir.




Çingiz müəllim ədəbi-bədii yaradıcılığa tələbəlik illərində başlamışdır. 1983-cü ildən dövri mətbuatda oçerk, məqalə və detektiv janrda yazdığı hekayələri ilə çıxış edir. 1989-cu ildən Azərbaycan Yazıçılar Birliyinin katibidir. Keçmiş SSRİ Yazıçılar İttifaqı nümayəndə heyətinin tərkibində 1978-ci ildə Çexoslovakiya və Yuqoslaviya, 1986-cı ildə Bolqarıstan, 1989-cu ildə isə Danimarka və Polşada səfərdə olmuşdur. Rus dilində yazır, həmçinin ingilis və italyan dillərində sərbəst danışır. 27 milyon nüsxədə olan 600-dən çox kitabı dünyada yayılmışdır. Bütün bu kitablar onu siyasi detektiv janrında yazan ən məhsuldar müasir yazıçılardan biri kimi tanıtdırmışdır. "Dronqo" serialgngn (2002) və "Məhkumlar" (2007) filminin ssenari müəllifidir. Əsərləri xarici ölkə xalqlarının dillərində kütləvi tirajla çap edilmişdir. Onun xidmətləri ölkə rəhbərliyi tərəfindən layiqincə qiymətləndirilmiş, "Qırmızı Əmək Bayrağı" ordeni, "Şöhrət" ordeni və medallarla təltif edilmişdir. 2014-cü ilin noyabr ayından Beynəlxalq Polis Təşkilatının (İnterpolun) fəxri səfiridir. Görkəmli yazıçımız Ç.Abdullayevin "Mavi mələklər", "Məhşər ayağında", "Monte-Mario təpəsində ölüm", "Mənim gözəl alibim", "Üçüncü variant", "İnsan ovu", "Milad bayramında açılan atəş", "Hammurappi qanunu", "Xəzinədar", "Qazanılmış cəhənnəm", "Bir ümman nifrət", "Pəri busəsi", "Aşkar metamarfoz", "Milyardın dəyəri", "Andorra sevməli və ölməli yerdir", "Şübhəsiz metamarfoz", "Qanın iki rəngi", "Dərdimə şərik ol" və digər bu kimi məşhur əsərləri dünyanın hər yerində böyük maraqla oxunur. Ç.Abdullayev sözün həqiqi mənasında xalqımızı, millətimizi bütün dünyada tanıdan və təbliğ edən böyük yazıçı və görkəmli ziyalıdır.



Görüşdə çıxış edən Xalq yazıçısı Ç.Abdullayev tələbələrlə canlı ünsiyyətin yaradılmasına görə ADPU-nun rektoru, professor Yusif Məmmədova, həmçinin universitetin professor-müəllim heyətinə və tələbə kollektivinə öz dərin təşəkkürünü bildirib, tələbə-gənclərin çoxsaylı suallarını cavablandırıb, öz yaradıcılıq planları və yeni əsərləri barədə məlumat verib. Eyni zamanda Ç.Abdullayev ulu öndər Heydər Əliyevin həmişə yazıçılara, sənət adamlarına yüksək qayğı və diqqətlə yanaşdığını, eyni zamanda onları təqib və təzyiqlərdən qoruduğunu, Azərbaycan dilinə böyük önəm verdiyini xüsusi qeyd edib. Bu qayğı və diqqəti Ulu Öndərimizin müdrik dövlətçilik kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev müasir dövrümüzdə uğurla davam etdirir.

Qeyd edək ki, Xalq yazıçısı Ç.Abdullayevin çıxışında həm də kitaba, ədəbiyyata, yazıçı qələminə münasibət məsələsi əsas məqamlardan biri olub. Son illər ölkəmizdə mütaliə səviyyəsinin aşağı düşməsindən çox təəssüfləndiyini bildirən yazıçı gəncliyə müraciətlə deyib: "Dəfələrlə demişəm, yenə də deyirəm: mütləq kitab oxuyun! Klassik və müasir yazıçılarımızın əsərlərini, dünya ədəbiyyatını oxuyun! Kitab oxumaq insanın dünyagörüşünün genişlənməsində, söz ehtiyatının zənginləşməsində, yüksək intellekt səviyyəsinə malik şəxsiyyət kimi yetişməsində mühüm rol oynayır. Mən yazıçı olmaqdan daha çox oxucuyam".



Inanırıq ki, Xalq yazıçı Ç.Abdullayevlə keçirilən bu görüş tələbələrimizin yaddaşında xoş bir xatirə kimi uzun müddət yaşayacaq.

**Mənsur İBRAHİMLİ**

# Xalqa, Vətənə sədaqətli xidmət nümunəsi

## *Səbail rayon məktəbliləri ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətini dərindən öyrənirlər*

Səbail rayonunun ümumtəhsil məktəblərində Azərbaycanın müasir tarixinin daha səmərəli öyrənilməsi məqsədi ilə XI sinif şagirdləri üçün «Ulu öndər Heydər Əliyev müstəqil Azərbaycanın qurucusu və memarıdır» və «Ümummilli lider Heydər Əliyevin ideyaları müasir Azərbaycanın sosial-iqtisadi inkişafının təminatçısıdır» mövzularında açıq dərslərin keçirilməsi davam edir. Dərslər Yeni Azərbaycan Partiyasının Səbail rayon təşkilatının qərargahında və rayonun ən böyük ali təhsil müəssisələrindən olan Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında və Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təşkil olunmuşdur.

Dərslərin yüksək səviyyədə, sistemli və planlı şəkildə keçirilməsi məqsədi ilə xüsusi qrafik tərtib olunmuş, rayonun orta və ali məktəblərinin peşəkarlığı, elmi-nəzəri, metodiki hazırlığı ilə fərqlənən nüfuzlu tarix müəllimləri seçilərək onlar üçün seminar keçirilmişdir.

Qeyd edək ki, Səbail rayonunda keçirilən növbəti açıq dərs fevral ayının 18-də ADPU-nun Böyük zalında keçirilmişdir. Açıq dərsdə rayonun müxtəlif orta məktəblərinin XI sinif






şagirdləri ilə yanaşı, Səbail RİH-in məsul əməkdaşları, pedaqoji işçilər, həmçinin universitetin müəllimləri iştirak etmişlər.

ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev ilk olaraq məktəbliləri burada fəaliyyət göstərən "Heydər Əliyev muzeyi" və "Heydər Əliyev məktəbinin lektoriyası" ilə tanış etdi, universitetin 95 illik tarixi barədə məlumat verdi. Ulu Öndərin muzeydə nümayiş olunan fotoları, onunla bağlı digər sənədlər, xüsusilə də, Heydər Əliyevin ADPU-da keçirilən tədbirlərdə iştirakı ilə bağlı stendlər məktəblilərdə xoş təəssüratlar oyatmışdır. Açıq dərs canlı ünsiyyət və şagirdlərin yüksək fəallığı şəraitində keçmişdir. Qeyd olunmuşdur ki, bütün həyatını xalqının tərəqqisi və inkişafına həsr etmiş ulu öndər Heydər Əliyevin müstəqil Azərbaycanın gələcəyi naminə gördüyü nəhəng işlər ona tariximizin yaddaşına əbədi həkk olmaq, öz xalqının qəlbində əbədi yaşamaq səadəti bəxş etmişdir. Bu dahi şəxsiyyətin mənalı və şərəfli ömür yolu Vətənə və xalqa sədaqətlə xidmət etmək nümunəsidir.

Ümummilli Liderin zəngin həyat yolu ilə tanış olan məktəblilər Ulu Öndərin Azərbaycanda yenidən hakimiyyətə qayıdışından sonrakı böyük fəaliyyətinə xüsusi maraq göstərmişlər.

Onlara məlumat verilmişdir ki, dahi rəhbər Heydər Əliyevin ötən əsrin 90-cı illərinin əvvəllərində erməni təcavüzü nəticəsində işğal və parçalanmaq təhlükəsi ilə üzbəüz qalmış Azərbaycanda müstəqil dövlət quruculuğu sahəsində fəaliyyəti ölçüyəgəlməz olmuşdur. Xalqımızın bu böyük oğlunun fədakarlığı və müdrik siyasəti sayəsində mövcud problemlər, dövlət çevrilişi cəhdləri aradan qaldırılmış və ölkəmizin gələcək iqtisadi inkişafı üçün böyük zəmin yaradılmışdır. Ulu öndər Heydər Əliyevin layiqli davamçısı olan Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin apardığı uzaqgörən siyasət və məqsədyönlü fəaliyyət nəticəsində bu gün Azərbaycan iqtisadi inkişaf və hərbi qüdrəti ilə regionun aparıcı dövlətinə çevrilmişdir. Azərbaycanın hərtərəfli inkişafı onun dünya dövlətləri arasında olan nüfuzunun durmadan artmasına səbəb olmuşdur.

Ulu öndər Heydər Əliyevin həyat və fəaliyyəti ilə bağlı məlumatlar şagirdlər tərəfindən böyük maraqla qarşılanmışdır.

**"Gənc müəllim"**

# Həsən İbrahim oğlu Mirzəyev



Azərbaycan ictimaiyyətinə ağır itki üz vermişdir. Tanınmış ictimai xadim və pedaqoq, Yeni Azərbaycan Partiyası Siyasi Şurasının üzvü, Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü, əməkdar elm xadimi, filologiya elmləri doktoru, professor Həsən İbrahim oğlu Mirzəyev 2015-ci il fevralın 25-də ömrünün 88-ci ilində vəfat etmişdir.

Həsən Mirzəyev 1927-ci il noyabr ayının 26-da Dərələyəz mahalındakı Qovuşuq kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra o, 1948-1950-ci illərdə Naxçıvan Dövlət Müəllimlər İnstitutunda, 1951-1955-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda ali təhsil almışdır.

Həsən Mirzəyev əmək fəaliyyətinə 1950-ci ildə doğma kəndində orta məktəb müəllimi kimi başlamışdır. 1955-ci ildə o, ali təhsilini başa vurduqdan sonra rayon xalq maarif şöbəsinin inspektoru və Qovuşuq kənd orta məktəbinin müəllimi, 1957-1959-cu illərdə isə məktəb direktoru işləmişdir. Həsən Mirzəyev 1959-1962-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda Azərbaycan dilçiliyi ixtisası üzrə aspiranturada oxumuş, aspiranturanı bitirdikdən sonra ömrünün sonunadək həmin İnstitutda çalışmışdır. O, müxtəlif illərdə müəllim, baş müəllim, dosent, professor, kafedra müdiri və dekan vəzifələrini tutmuşdur.

Respublikanın ictimai-siyasi həyatında yaxından iştirak edən Həsən Mirzəyev 1998-ci və 2000-ci illərdə iki çağırış Azərbaycan Respublikası Milli Məclisinin deputatı seçilmişdir. Bütün bu dövr ərzində öhdəsinə düşən hər bir işə o, dərin məsuliyyətlə yanaşaraq, fəaliyyət göstərdiyi sahələrdə yüksək peşəkarlıq nümayiş etdirmişdir.

Həsən Mirzəyev 1965-ci ildə namizədlik, 1988-ci ildə doktorluq dissertasiyalarını müdafiə etmiş və 1990-cı ildə professor elmi adını almışdır.

Azərbaycan filologiya elminin inkişafında Həsən Mirzəyevin özünəməxsus yeri vardır. O, dilçiliyin müxtəlif problemlərinə dair bir sıra sanballı tədqiqatları ilə tanınırdı. Alimin xüsusən Qərbi Azərbaycanın yer adları ilə bağlı araşdırmaları milli tarixin öyrənilməsi baxımından xüsusi əhəmiyyət kəsb edir. Onun, həmçinin folklorşünaslıq sahəsində fəaliyyəti təqdirə layiqdir. Həsən Mirzəyevin 200-dən çox elmi əsəri, o cümlədən 25 kitabı və 10-a yaxın dərs vəsaiti işıq üzü görmüşdür. O, eyni zamanda, mütəmadi surətdə bədii yaradıcılıqla məşğul olurdu.

Filologiya üzrə ixtisaslı kadrların hazırlanması işində Həsən Mirzəyev öz bilik və bacarığını əsirgəməmişdir. Onun rəhbərliyi altında bir çox tədqiqatçı dissertasiya müdafiə etmişdir. Həsən Mirzəyevin dilçiliyin aktual məsələləri ilə bağlı müxtəlif elmi simpozium və konfranslardakı çıxışları daim rəğbətlə qarşılanmışdır.

1990-cı illərin əvvəllərindən etibarən respublikada cərəyan edən ictimai-siyasi proseslər zamanı Həsən Mirzəyev fəal vətəndaşlıq mövqeyi nümayiş etdirmiş və taleyüklü hadisələrə münasibətdə Azərbaycan xalqının milli mənafelərinə daim sadiq qalmışdır.

Həsən Mirzəyevin çoxillik elmi-pedaqoji və ictimai fəaliyyəti layiqincə qiymətləndirilmişdir. O, bir sıra təltiflərə, o cümlədən müstəqil Azərbaycan Respublikasının ali mükafatlarından olan "Şöhrət" ordeninə layiq görülmüşdür.

Tanınmış pedaqoq, dilçi alim və xeyirxah insan Həsən İbrahim oğlu Mirzəyevin xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır.

**Allah rəhmət eləsin!**

**İlham ƏLİYEV, Artur RASİZADƏ,
Oqtay ƏSƏDOV, Ramiz MEHDİYEV,
Mehriban ƏLİYEVA, Elçin ƏFƏNDİYEV,
Əli HƏSƏNOV, Əli ƏHMƏDOV,
Akif ƏLİZADƏ, Hacıbala ABUTALIBOV,
Fatma ABDULLAZADƏ, Mikayıl CABBAROV,
Anar RZAYEV, Yusif MƏMMƏDOV,
Ağamusa AXUNDOV, Tofiq HACIYEV**

# Əbdül Əli oğu Əlizadə



Azərbaycan elm və təhsil ictimaiyyətinə ağır itki üz vermişdir. Tanınmış psixoloq alim, psixologiya elmləri doktoru, professor, Əməkdar elm xadimi, "Şöhrət" ordenli, Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü Əbdül Əli oğlu Əlizadə fevral ayının 22-də ömrünün 83-cü ilində uzun sürən ağır xəstəlikdən sonra vəfat etmişdir.

Ə. Əlizadə 1932-ci il avqust ayının 16-da Bakı şəhərində anadan olmuşdur. O, 1950-ci ildə Bakı şəhərindəki 31 nömrəli orta məktəbi bitirdikdən sonra Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Filologiya fakültəsinin məntiq-psixologiya şöbəsinə daxil olmuşdur. Hələ tələbəlik illərində elmi yaradıcılıqla məşğul olmuş, tədqiqatlarının nəticələrini ADU-nun "Elmi əsərləri"ndə nəşr etdirmişdir. 1955-ci ildə ADU-nu fərqlənmə diplomu ilə başa vuran Ə.Əlizadə Əzim Əzimzadə adına Azərbaycan Dövlət Rəssamlıq Məktəbində psixologiya və pedaqogika müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1959-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) psixologiya üzrə aspiranturaya daxil olan Ə.Əlizadə 1962-ci ildə "Şagirdlərin təxəyyül fəaliyyətində analiz-sintez proseslərinin xüsusiyyətləri" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir.

Ə.Əlizadə 1975-ci ildə "Cinsi dimorfizm və şəxsi qarşılıqlı münasibətlərin formalaşmasının psixoloji xüsusiyyətləri" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Bu dissertasiya işi psixologiya elmində cinsi fərqlərin psixologiyası və cinsi tərbiyə konsepsiyasının formalaşmasında önəmli rol oynamışdır. Ə.Əlizadə bu əsərə görə SSRİ-də cinsi tərbiyə və cinsi fərqlərin psixologiyası sahəsində tanınmış alimlərdən biri kimi söz sahibinə çevrilmişdir.

Ə.Əlizadə 1975-2013-cü illərdə 38 il fasiləsiz olaraq ADPİ-də Ümumi psixologiya kafedrasının müdiri olmuş, pedaqogika və psixologiya üzrə yüksəkixtisaslı kadrların hazırlanmasında səmərəli fəaliyyət göstərmişdir. Onun rəhbərliyi ilə 1 nəfər elmlər doktoru, 50 nəfər psixologiya üzrə fəlsəfə doktoru elmi dərəcəsi almışdır. Alimin ölkəmizdə və onun hüdudlarından kənarda psixologiyanın aktual problemlərinə həsr olunmuş müxtəlif elmi simpozium və konfranslardakı çıxışları mütəxəssislər tərəfindən yüksək qiymətləndirilmişdir.

Psixologiya üzrə dərsliklərin hazırlanmasında yaxından iştirak edən professor Ə.Əlizadənin Azərbaycanda təhsil sahəsində islahatların hazırlanması və həyata keçirilməsində xidmətləri əvəzsizdir. Onun hazırladığı təlim məqsədlərinin taksonomiyası tədris prosesini elmi-metodik səviyyədə planlaşdırmaq və nəticəni ölçmək imkanı verir.

Professor Ə.Əlizadənin istedadlı uşaqlarla bağlı apardığı tədqiqatlar və onun əsasında hazırladığı "İstedadlı uşaqlar. Psixopedaqoji məsələlər." (Bakı,2005) monoqrafiyası psixologiya və pedaqogika elminə dəyərli töhfədir. Ümumiyyətlə, istedadlı alim Ə.Əlizadənin pedaqogika və psixologiyanın müxtəlif sahələrinə həsr olunmuş 70 monoqrafiya, dərslik və dərs vəsaiti, 500-dən artıq elmi məqaləsi nəşr olunmuşdur.

Professor Ə.Əlizadənin elmi-pedaqoji fəaliyyəti dövlətimiz tərəfindən layiqincə qiymətləndirilmişdir. Görkəmli alim Ə.Əlizadə bir sıra orden və medallarla, o cümlədən müstəqil Azərbaycan Respublikasının ali mükafatı olan "Şöhrət" ordeni və "Əməkdar elm xadimi" fəxri adı ilə təltif olunmuşdur. O, eyni zamanda Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü idi.

İşlədiyi kollektivin və onu tanıyanların sevimlisi olan Ə.Əlizadə yüksək əxlaq və fəziləti, səmimiyyəti, təvazökarlığı və digər insani keyfiyyətləri ilə həmişə örnək olmuşdur. Görkəmli psixoloq, təcrübəli təhsil işçisi və xeyirxah insan Əbdül Əli oğlu Əlizadənin xatirəsi onu tanıyanların qəlbində həmişə yaşayacaqdır.

**Allah rəhmət eləsin!**

**Azərbaycan Respublikası Təhsil Nazirliyi
Azərbaycan Dövlət Pedaqoji Universiteti**

# Yaradıcılıq ittifaqları haqqında dəyərli tədqiqat əsəri

Azərbaycan müstəqillik əldə etdikdən sonra Azərbaycan tarixinin ayrı-ayrı problemlərinin öyrənilməsi sahəsində xeyli uğurlar əldə olunmuşdur. Xüsusilə də, Azərbaycan xalqının XIX və XX əsrlər tarixinin ilkin mənbələr əsasında işlənilməsi sahəsində aparılan tədqiqatlar əhatə dairəsi və problemin qoyuluşu ilə fərqlənir. Lakin təəssüf hissi ilə qeyd olunmalıdır ki, mədəniyyət problemlərinin işlənməsi, ayrı-ayrı mərhələlərdə formalaşan mədəni dəyərlərin mahiyyətinin açılması sahəsində tədqiqatları qənaətbəxş hesab etmək olmaz. Tədqiqata cəlb olunan problemlərin əksəriyyəti isə təhsil və idman sahəsi ilə əlaqədardır. Bu baxımdan, mədəniyyət problemlərinin, xüsusilə də, yaradıcılıq ittifaqlarının Sovetlər Birliyinin dağılması ərəfəsindəki vəziyyətinin araşdırılması, onların fəaliyyət sahələrinin xüsusiyyətlərinin üzə çıxarılması, yaradıcılıq ittifaqlarının işinin forma və xüsusiyyətlərinin müəyyənləşdirilməsi sahəsində hiss bir boşluq hiss olunur.

Bəllidir ki, ayrı-ayrı sahələrdə cəmiyyətdə əldə olunan uğurların müəyyənləşdirilməsində mədəniyyət müəssisələrinin fəaliyyəti danılmazdır. Mədəniyyətin səviyyəsi, xalqın mənəvi aləminin zənginləşməsi təkcə təhsil sahəsi ilə məhdudlaşmır. Bu prosesdə mətbuat, ədəbiyyat və incəsənət, səhiyyə və mədəni-maarif müəssisələr ilə yanaşı, yaradıcılıq təşkilatları-yazıçılar, bəstəkarlar, rəssamlar, kinematoqrafçılar və teatr xadimləri ittifaqları önəmli rola malikdirlər. Təəssüflə qeyd olunmalıdır ki, adları qeyd olunan sahələrə dair tədqiqatlarda müəssisələrin sayı, tədbirlərin xronologiyası, tamaşaçı sayı göstərilməklə işlər tamamlanmış hesab edilmiş, mədəniyyət müəssisələrinin fəaliyyətinin istiqamətləri, kadr hazırlığının forma və xüsusiyyətləri, qarşıya qoyulmuş ictimai-siyasi və sosial-iqtisadi vəzifələrin yerinə yetirilməsi sahəsindəki fəaliyyəti, əldə olunmuş nəticələrdə onların payı, nəhayət, cəmiyyətin formalaşmasında onların müsbət və mənfi rolu sənədlərin dili ilə açıqlanmamışdır. Bu baxımdan, «Mütərcim» nəşriyyatının Bakı Dövlət Universitetinin (BDU) professoru Nisbət Canməmməd qızı Mehdiyevanın 2014-cü ildə nəşr etdiyi "Azərbaycan yaradıcılıq ittifaqlarının mədəniyyətin inkişafı sahəsində fəaliyyəti (1960-1980-ci illər)" adlı monoqrafiyası diqqəti cəlb edir.




Öncə qeyd edim ki, tədqiqatın obyekti maraq doğurur. Əsərdə yaradıcılıq ittifaqlarının strukturu araşdırılmış, həyata keçirilən tədbirlərin forma və xüsusiyyətləri müəyyənləşdirilmiş, tətbiq sahələri qruplara ayrılmış, repertuar və mövzu dəyişikliklərinin səbəbləri və bunun insanların ideya-siyasi tərbiyəsi sahəsində əhəmiyyəti sənədlər, faktlar və arxiv materialları əsasında araşdırılmışdır.

Professor N.Mehdiyevanın bəhs olunan sahə üzrə tədqiqatçılardan fərqli xüsusiyyəti ondan ibarətdir ki, o, standart yolla getməmiş, kütlələrin qarşıya qoyulmuş vəzifələrin yerinə yetirilməsinə səfərbər olunması sahəsində həyata keçirilən tədbirlərin spesifik xüsusiyyətləri və əldə olunmuş nəticələr fakt və rəqəmlərlə təsdiq olunmuşdur. Təbii ki, burada da Nisbət xanım rəhbər təşkilatların statistikasına üstünlük verməmiş, kütləvi informasiya vasitələrinin fikir və mülahizələrini, insanların rəy və təkliflərini araşdırmış, nəticələri ümumiləşdirmişdir.

Yaradıcılıq ittifaqları dəyərkən bədii ziyalılar göz önündə canlanır. Professor N.Mehdiyeva ötən əsrin 1960-1980-ci illərində yaradıcılıq təşkilatlarının fəaliyyətini, ayrı-ayrı sənət adamlarının fəaliyyətini ümumiləşdirmiş, mədəniyyət problemlərinə nəsillərin varisliyi prinsiplərindən yanaşmışdır. Müəllif doğru olaraq yerlərdə həyata keçirilən işlərin bilavasitə Mərkəzin qərar və sərəncamları əsasında qurulduğunu nəzərdən qaçırmamış, digər tədqiqatçılardan fərqli olaraq Azərbaycan yaradıcılıq ittfaqlarına alt sistem kimi yanaşmamış, onların fəaliyyətinin nəticələrini ümumiləşdirərkən milli xüsusiyyətləri, Türk dünyası ilə ortaq dəyərləri diqqətdən qaçırmamışdır. Bu baxımdan, dil və din məsələlərinin yardıcılıq ittifaqlarının fəaliyyət mərkəzində olması xüsusi vurğulanmışdır.

Professor N.Mehdiyeva mədəniyyət məsələlərinə bir üstqurum kimi yanaşsa da, iqtisadi bazisdə baş verən dəyişikliklə-ri, mədəniyyət müəssisələrinin fəaliyyət istiqamətlərini kompleks halda araşdırmış, yol verilmiş nöqsanlar və çatışmazlıqlar təhlil olunmuş, təkliflərini irəli sürmüşdür. Belə hesab edirik ki, mədəniyyət tarixi üzrə Əlaqələndirmə Mərkəzinin yaradılması təklifi müsbət qiymətləndirilməlidir.

Professor N.Mehdiyeva doğru göstərir ki, XX əsrin ikinci yarısından başlayan diskussiyalar, milli yaddaşın oyanmasının və azadlıq ideyalarının yaradıcılıq ittifaqlarının fəaliyyətində hiss olunması, repertuarda milli-azadlıq məsələlərinə üstünlük verilməsi, Azərbaycan cəmiyyətində müxtəlifyönümlü təşkilatların yaranması və onların işində yaradıcı ziyalıların iştirakı həm də yaradıcılıq ittifaqlarının uğuru hesab olunmalıdır.

Monoqrafiyada yaradıcılıq ittifaqlarının ruspublikalararası və beynəlxalq əlaqələri-qastrol səfərləri, dekadalar, yaradıcılıq diskussiyaları, yarmarkalar, kitab nəşi və s. arxiv və mətbuat materialları, statistik külliyyatlar əsasında faktlarla göstərilmişdir.

Tədqiqat işinin xronologiyası XX əsrin 60-80-ci illərini əhatə edir. Ümummilli lider Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi 70-80-ci illərdə Azərbaycan təhsili intibah dövrünü yaşadı. Həmin dövrdə məktəbəqədər tərbiyə, ümumtəhsil, texniki peşə və orta ixtisas məktəblərinin, ali təhsil müəssisələrinin şəbəkəsinin inkişaf etdirilməsi ulu öndər Heydər Əliyevin diqqət mərkəzində olmuşdur. 1970-1982-ci illərdə Azərbaycanda 5 ali məktəb yaradılmışdır.

1970-1980-ci illərdə dahi öndər Heydər Əliyevin şəxsi təşəbbüsü ilə Azərbaycandan kənarda, keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərlərinin 170-dən çox ən məşhur ali məktəblərində respublikamızın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gəncin ali təhsil almasına, yüksəkixtisaslı mütəxəssis kimi yetişməsinə imkan və şərait yaradılmışdır.

Müdrik dövlət rəhbəri Heydər Əliyevin milli-ideoloji konsepsiya yaratması o zamankı SSRİ-nin rəhbər partiya işçilərinin nəzərindən qaçmırdı. Ona qısqanclıqla yanaşalar da olmuşdur. Ancaq Ulu Öndər bunu elə ustalıqla edirdi ki, onlar bu böyük zəka sahibinin qarşısında etiraz etməyə, hansısa düzəlişlərin həyata keçirilməsinə cəsarət etmirdilər. Ulu öndər Heydər Əliyev işini gözəl bildiyi, hadisələrin gedişini diqqətlə izlədiyi, düzgün nəticə çıxarmağı bacardığı üçün, Qazaxıstan Prezidenti Nursultan Nazarbayev təbirincə desək, «...xalqı birləşdirməyə və onu tərəqqi, inkişaf yoluna istiqamətləndirməyə müvəffəq olmuşdur...».

Ümummilli Lider sözün həqiq mənasında millətçi idi, ancaq bu millətçilik hissləri şovinizmdən çox-çox uzaq idi. Elə bu səbəbdən də, Azərbaycan xalqının mənşəyi, formalaşması, millətin təşəkkülü kimi mühüm tarixşünaslıq məsələləri məhz ötən əsrin 70-ci illərində kəskinliyi ilə qoyulmuş, müzakirələr keçirilmiş, yeni elmi konsepsiya yaranmışdır. 70-ci illərdə Azərbaycanda sağlam millətçilik ideyalarının yayılmasında, xalqda milli mənlik şüurunun və milli qürur hissinin tərbiyə olunmasında böyük vətənpərvər Heydər Əliyevin xidmətləri misilsizdir.

Görkəmli siyasi xadim Heydər Əliyev 60-cı illərin sonu, 70-ci illərin əvvəllərində Azərbaycan tarixinin problemlərinin yenidən işlənməsinə nail oldu. Şimali Azərbaycanın Rusiya tərəfindən işğalı, 1918-ci il Mart soyqırımı, Azərbaycan Xalq Cümhuriyyətinin tarixinin öyrənilməsi, 10 cildlik Azərbaycan Sovet Ensiklopediyasının nəşr olunması Ümummilli Liderin apardığı düzgün milli siyasətin nəticələri hesab olunmalıdır.

Ulu öndər Heydər Əliyev xalqımızın mənəvi irsi ilə daim fəxr etmişdir. O, Azərbaycanı əzəməti bir binaya bənzədirdi. Bu bina kərpic-kərpic tikilmiş, nəsillərdən nəsillərə yadigar kimi ötürülmüşdür. Müstəqil Azərbaycanın banisi, memarı isə ulu öndər Heydər Əliyev olmuşdur. Özünün təbiri ilə desək, Azərbaycanı kərpic-kərpic tikmişdir.

Böyük dövlət xadimi Heydər Əliyev unudulmuş, yaddan çıxarılmağa məcbur edilmiş minlərlə soydaşımızı sovet ideologiyasının məkrli məngənəsindən xilas etmişdir. Millətçi damğası vurulan Nəriman Nərimanovun Heydər Əliyevin qətiyyəti nəticəsində xalqımıza qaytarılması, onun 100 illik yubileyinin təntənə ilə qeyd edilməsi, Bakıda və Ulyanovskda əzəmətli heykəlinin qoyulması, Bakıda və Tiblisidə ev-muzeylərinin açılması, böyük ədib Hüseyn Cavidin nəşinin Azərbaycana gətirilməsi, onun doğma Naxçıvanda dəfni, məqbərəsinin inşa edilməsi, 416-cı diviziyanın qəhrəmanlığını əbədiləşdirmək üçün Taqanroq şəhərinin yaxınlığında ucalan əzəmətli memorial, Krımda həlak olmuş azərbaycanlıların şərəfinə Simferopolda Sapun dağında 77-ci atıcı diviziyanın şərəfinə tikilən xatirə kompleksi, bir əsrə yaxın qadağan olunmuş Cənub mövzusu, Təbriz mövzusunun gündəmə gətirilməsi Heydər Əliyevin Vətən sevgisinin zirvəsi idi. Təbii ki, sadalananlar professor N.Mehdiyevanın monoqrafiyasında daha geniş, faktlar və rəqəmlərin dili ilə açılmışdır.

Azərbaycan dövlət müstəqilliyinin 24-cü ilini yaşayır. Müstəqillik illərində mədəniyyətin inkişafı sahəsində böyük uğurlar əldə olunmuş və bu sahədə Heydər Əliyev Fondunun mühüm xidmətləri var. Mədəniyyət və Turizm Nazirliyi, yaradıcılıq ittifaqları milli-mədəni dəyərlərin dirçəldilməsi, qorunub saxlanılması və təbliği sahəsində xeyli iş görmüşlər. Əlbəttə, bu uğurlarda XX əsrin 60-80-ci illərində qazanılmış müvəffəqiyyətlər, toplanmış təcrübə əhəmiyyətli rol oynamışdır. Bu baxımdan, professor N.Mehdiyevanın "Azərbaycan yaradıcılıq ittifaqlarının mədəniyyətin inkişafı sahəsində fəaliyyəti (1960-1980-ci illər)" adlı monoqrafiyası elmi əhəmiyyətinə, faktların bolluğuna və ümumiləşdirmə sanbalına görə təqdirəlayiqdir. Belə hesab edirik ki, mədəniyyət ixtisasları üzrə təhsil alanlar, yaradıcılıq ittifaqlarının fəaliyyətinin tədqiqatçıları N. Mehdiyevanın bu yüksək səviyyəli monoqrafiyasından faydalanacaqlar.

Hörmətli Nisbət xanım! Siz BDU-nun professoru kimi respublikamızda mədəniyyət tarixi problemlərinin tədqiqatçılarından biri olmaqla yanaşı, həm də gözəl pedaqoq, hər cür tərifəlayiq Azərbaycan qadınısınız. Sizə cansağlığı, uzun ömür, yeni yaradıcılıq uğurları arzu edirik.

**Mais Əmrahov,
tarix üzrə elmlər doktoru,
professor**

**Füzuli Əsgərli - 70**

# Bir alim ömrünün hekayəti, yaxud 70-ci ilin baharı ərəfəsində

**1945-ci ilin martın 18-i idi. Bahar bayramına cəmi 3 gün qalırdı. Həm də ilin sonuncu çərşənbəsi idi. Təbiətdə bayram ovqatı açıq aydın hiss olunurdu. Amma insanların həyatında, güzəranında, qəlblərdə bu hiss o qədər də hiss olunmurdu. Çünki müharibə hələ qurtarmamışdı. Cəbhədən qara kağızlar gəlməkdə, ölkə müharibənin vurduğu maddi və mənəvi acıları hələ yaşamaqda idi...**

**Belə bir gündə, Azərbaycanın gözəl guşələrindən olan Masallı rayonunun Çaxırlı kəndində Feyruz Mir Əsgər oğlunun ailəsində bir oğlan uşağı dünyaya gəldi. Bu Feyruz kişinin ilk oğlan övladı idi və elə ona görə də təkcə Feyruz kişi- nin ailəsi deyil, bütün qohum-əqrəba bu körpənin dünyaya gəlməsinə sevindi. Sonralar da həmin körpə böyüdükdə hamının sevimlisinə çevrildi. Bütün qohum-əqrabadan nəvaziş, diqqət gördü.**

**Sonuncu çərşənbədə, bayram ərəfəsində dünyaya göz açdığı üçün atası əvvəl ona Bayram adı qoymaq istədi. Ancaq sonra fikrini dəyişib Füzuli adını verdi. Atanın yenicə doğulmuş oğluna belə bir ad seçməsi onun ustad şairimiz Məhəmməd Füzuliyə rəgbətindən irəli gəlirdi. Belə ki, böyük ədəbiyyat, poeziya həvəskarı olan Feyruz kişi özü də arabir şeirlər yazırdı. Onun hədsiz məhəbbətlə sevdiyi və vurğunu olduğu şairlərdən biri də Məhəmməd Füzuli idi. Həmin vurğunluq və məhəbbətin təzahürü kimi oğluna da Füzuli adını qoydu.**

Çaxırlı kəndi qədim tarixə malik olsa da, onun nə vaxt salındığı məlum de- yil. Kənd rayon mərkəzindən 9 kilometr aralıda, Bakı-Astara yolundan 2 kilometr məsafədə yerləşir. Səfalı, gözəl təbiətə, saf, təmiz qəlbli, qonaqpərvər, insanpərvər, xeyirxah insanlara malik olan bu kənd varlı-bərəkətli münbit torpağı ilə də diqqəti cəlb edirdi. Elə bu səbəbə görə, müharibədən sonrakı ağır illərdə kənd kolxozunun məhsulu həmişə rayonunun başqa kolxozlarından çox olar, o, dövlətə daha çox məhsul verdiyinə görə kolxozçulara hər əməkgünü üçün müəyyən miqdar taxılla bərabər pul da verilərdi.

Müharibə qurtarsa da, onun ağrı-acıları, vurduğu yaralar, törətdiyi çətinliklər hələ davam etməkdəydi. Bir çoxlarının gözləri hələ də yollardaydı. Güzəran çətin, dolanışıq ağır idi. Stalin reyiminin yaratdığı repressiya xofu da şüurlara hakim kə- silmişdi. Həyat insanı sıxanda, dövran onu əzəndə ümid ancaq gələcəyə qalır. Füzuli müəllimin uşaqlıq həyatı da onu əhatə edən insanların ümid işığıyla yaşa- dıqları bir dövrə təsadüf edir.

Füzuli müəllim gözlərini açanda, evdə atasının az-çox toplayıb yıpdığı ki- tabları, yəni balaca bir kitabxana görüb. Bir tərəfdən bu kitablar, bir tərəfdən də təbiətində yaranan elmə, ədəbiyyata həvəs onda oxumağa çox erkən maraq oya- dıb. Hələ məktəb yasına çatmamış artıq o, hərfləri tanıyır, kiçik həcmli kitabları oxuya bilirdi. Bu zaman onun beş yaşı var idi. Atası Feyruz kişi beş yaşlı oğlunun bu qabiliyyətini görüb onu məktəbə göndərmək istədi. Hətta balaca Füzuli bir neçə gün məktəbə də getdi. Amma boyu balaca olduğundan, partada oturanda yazı löv- həsini görə bilmirdi. Elə buna görə də qaygıkeş bir insan olan, sonralar Füzuli müəllimin ehtiramla xatırladığı Abıhüseyn müəllim məsləhət gördü ki, hələ tezdir, uşağı məktəbə yeddi yasında göndərmək məqsədəuyğundur. Belə də oldu.

Yeddi yaşında məktəbə gedən Füzuli şagird yoldaşlarından fərqli olaraq yazmağı və oxumaqı kifayət qədər bacarırdı. Bu səbəbə sinif müəllimi Abıhüseyn Xəlifəli tapşırdı ki, o, sinfə "Əlifba" kitabını yox, "Ana dili" kitabını gətirsin. Çünki, onun "Əlifba" kitabında olanları öyrənməyinə ehtiyac yoxdur.

Balaca Füzulinin kitab oxumağa sonsuz həvəsi vardı. Hətta yemək yeyəndə belə onları əlindən yerə qoymurdu. Bunun üstündə anası onu tez-tez danlayardı. O, evlərindəki bir cildlik "Azərbaycan nağılları"nın fantaziyasına dalır, burdakı əhva- latlar və qəhrəmanların taleyi ona dərin təsir göstərir, xəyalən onu uzaqlara, sirli-sehirli bir dünyaya aparırdı. Həmin nağıllardan çoxu indi də onun yaddaşına həkk olunub. Məsələn: "Qaraqaşın nağılı", "Beykəsin nağılı", "Tumar pəhləvanın nağılı", "Balıqçının nağılı", "Gül Sənavərə neylədi, Sənavər Gülə neylədi" və s.

Füzuli müəllimin anası Xeyranisa xanım zəhmətkeş, istiqanlı, açıqgöz bir bir qadın idi. Çoxlu sayda xalq ədəbiyyatı nümunələrini sinəsinə yazmışdı. Nə qədər desən bayatı bilirdi. Xeyranisa xanım toylarda qadın məclislərində gözəl folklor bilicisi kimi həmişə fərqlənərdi. Yaxşı yaddaşı, duzlu-məzəli söz-söhbətləri, kö- nülaçan zarafatları vardı. Toy məclislərində qadın halayının başında durar, "A yordu, yordu, yordu, Görək kim kimi yordu" şəklində başlanan mahnı-deyişmədə həmişə qalib olardı.

Xeyranisa xanım doqquz uşaq anası olub. Bu böyük ailənin cəfasını çək- mək, əlbəttə, asan iş deyildi. Lakin Xeyranisa xanım əzabkeş, qayğıkeş analıq şərəfini ləyaqətlə qoruyub, övladlarına fədakarlıqla analıq edib. Füzuli müəllimin bir ziyalı kimi yetişməsində anasının əvəzsiz rolu olub. İllər ötüb keçsə də, o, ana şəfqətini yenə də üstündə hiss edir. Qayibanə olsa da.



Nənə kimi sevilən, kimsəsiz Tamam qarı da xeyirxah insan idi. Feyruz ki- şinin evi ikimərtəbəli, çoxotaqlı idi və o, otaqlardan birini Tamam nənəyə ayırmışdı. Tamam nənə zahirən bu otağın tək sahibı olsa da, uşaqlar həmişə onun ba- şına yığışardılar. Tamam nənə də folklor nümunələrini bilməkdə sinədəftər idi. Xalq təbabətini, türkəçarələri gözəl bilir, bir sıra xəstəlikləri müalicə edirdi. O, qərib həyatı sürsə də, kiçik Füzulinin doğma nənəsini əvəz edirdi. İndi də onu şirin və xoş xatirələrlə yada salır. Bu mehriban, həlim və istiqanlı qarı uşaqları həmişə başına yığar, onlara şirin nağıllar danışar, folklor örnəkləri deyərdi. Onun danışdığı və indi də Füzuli müəllimin hafizəsində yaşayan "Tiləpəpirin nağılı", təəssüf ki, hələ də heç bir yerdə çap olunmayıb. Sinəsi söz xəzinəsi olan bu həlim nənədən Füzuli müəllim çox şey öyrənmişdir. Tamam nənədən öyrəndiyi xalq yaradıcılığı nümunələrindən o, bu gün də yeri gəldikcə auditoriyalarda da istifadə edir.

Füzuli müəllimin ilk dəfə kənd kitabxanasına getdiyi gün də yadındadır. Onda onun cəmi səkkiz yaşı var idi. Çaxırlı kəndində bir kitabxana və bir qira- ətxana vardı. Atası balaca Füzulinin kitaba olan sonsuz marağını görüb oğlunu kitabxanaya üzv yazdırdı. İlk dəfə o, kitabxanaçı Manisə xanımın məsləhəti ilə S.S.Axundovun "Qorxulu nağıllar" kitabını aldı. Xeyirxah bir insan olan Manisə xanım Füzulinin səliqəli, həvəskar bir oxucu olduğunu, tez-tez kitab aldığını görüb, ona daha böyük həcmli kitablar təklif etməyə başladı. Artıq 10-11 yaşlarında Füzuli öz tay-tuşlarından fərqli olaraq daha çox kitab mütaliə etmişdi.

Kitabxana ilə əlaqəli maraqlı bir əhvalat da onun indiki kimi yadındadır. Belə ki, bir dəfə Füzulinin, 10-11 yaşlı uşağın adına iri həcmli kitabların olduğunu görən Bakıdan gələn komissiya üzvləri belə hesab edirlər ki, həmin kitabları ki- tabxanaçı saxta şəkildə anketə özü yazıb. Kəndin kuryeri ilə Füzulini çağırtdırır- lar. Anketdən oxuyurlar ki, Füzuli sonuncu dəfə L.Kassil və M.Polyanovskinin qələmə aldıqları "Kiçik oğul adına küçə" əsərini götürüb. Həmin əsərdən Füzuliyə suallar verirlər. Balaca Füzuli həmin suallara utana-utana, lakin doğru-dürüst ca- vablar verir. Onlar Füzuliyə: "Sağ ol, oğlum", - deyə minnətdarlıq edirlər. Bu əh- valat onun kitaba həvəsini bir az da artırır. Komissiya üzvləri kitabxanaçının işindən də razı qalırlar.

Füzuli müəllim Çaxırlı kəndində ancaq ibtidai təhsil ala bildi. Çünki kənddə yalnız ibtidai məktəb fəaiyyət göstərirdi. Sonra o, qonşu Kəbləhüseyli kəndindəki yeddillik məktəbin 5-ci sinfinə yollandı. Bir kilometr aralıqda yerləşən qonşu kənd məktəbinə qışın soyuğunda, yazın, payızın yağışında, palçıqda, suda həmişə piya- da gedib gələrdi. Özü də paltosuz və çantasız. Ailə maddi cəhətdən o qədər də təm- taraqlı olmadığından valideynlərin buna imkanı yox idi. Balaca Füzuli kitablarını qışın soyuğunda da qoltuğunda daşıyardı. Məktəbə palto ilə gedib gələn şagirdlərə həvəslə baxardı. Amma oxumaqda hamıdan üstün idi. Bədii kitabları daha çox mütaliə edərdi. Hətta valideynləri arabir onu danlayardı ki, dərslərinə fikir ver, bədii kitablara az vaxt ayır.

Orta məktəb müəllimlərindən Azərbaycan dili və ədəbiyyatı fənlərini müx- təlif illərdə tədris edən Məmməd Nəbiyev və Leyla xanım Əliyeva Füzuli müəl- lim daha çox xatırlayır. Onun ədəbiyyata marağının artmasında, bir ədəbiyyatşünas kimi yetişməsində bu müəllimlərin müəyyən rolu olub. Füzuli müəllim indi də onları hörmət və sevgi ilə xatırlayır. Elmə, maarifə həvəsi olan şagird yoldaşları da Füzuli müəllimin xatirindədir. Həmin şagirdlərdən Sərdar Allahyarlı, Sabir Xəlifəli, Musa Əhmədov, Vəkil Ağayev, Hekayət Əsgərov, Tofiq Hüseynov və digərlərini qeyd etmək olar. Onlardan bəziləri elmi axtarış yolunu sonra da davam etdirdilər. S.Xəlifəli iqtisad, M.Əhmədov isə texniki elmlər üzrə namizədlik dissertasiyaları müdafiə edərək elmlər namizəd elmi dərəcəsi aldılar.

Orta məktəbi bitirib 18 yaşına çatdıqda gənc Füzulini həqiqi xidməti gön- dərdilər. O, üç il Çelyabinsk vilayətində məxfi hərbi hissədə xidmətdə oldu. Mülki həyata qayıtdıqdan sonra Bakı Şin Zavodunda yığıcı, leytenant Şmidt adına Za- vodda (sonra Səttarxan adına oldu) tornaçı işlədi.

1969-cu ilin 8 mart günü Füzuli müəllimin həyatında ən əlamətdar günlərdən biri oldu. Həmin gün o, orta məktəb müəlliminin qızı Elmira xanımla ailə həyatı qurdu. Bu nəcib və sədaqətli Azərbaycan qızının ayağı düşərli oldu. Məhz həmin il gənc Füzuli ADPİ-nin (indiki ADPU-nun) Filologiya fakültəsinin əyani şöbəsinə daxil oldu. Cəfakeş, ailəcanlı, səmimi bir ömür-gün yoldaşı olan Elmira xanım hə- yat yoldaşının uğurla təhsil alması üçün heç nəyi əsirgəmədi. Müxtəlif istehsalat müəssisələrində işlədi, ailənin maddi təminatı yolunda cəfakeşliklə çalışdı.

Tələbəlik illərində gənc Füzuli elmi, savadı və ictimai fəallığı ilə diqqəti cəlb etdi. Qrup nümayəndəsi, komsomol komitəsinə büro üzvü seçildi. "Məşəl" tələbə teatrına bədii rəhbər təyin edilməsi isə onun bacarığının, istedadının yeni key- fiyyətlərini üzə çıxardı. O, həvəskar tələbələrin iştirakı ilə N.Hikmətin "Unudulan adam", A.Safronovun "Kişilərə inanmayın", S.Rəhmanın "Toy", "Xoşbəxtlər", A.Məmmədovun "Həmyerlilər", "Kişilər" və sair əsərləri müvəffəqiyyətlə tama- şaya qoydu. Teatr dərnəyinin üzvləri tələbə teatrlarının respublika müsabiqəsində, radio və televiziya verilişlərində uğurlu çıxış etdilər. Azərbaycanın xalq artisti Ramiz Novruz da "Məşəl" tələbə teatrının yetirmələrindəndir. Bu gün onunla bir yerdə çalışan həmkarları - Qüdrət Umudov, Kamil Bəşirov da o dərnəyim fəal üzvlərindən olublar. Teatr sahəsindəki uğurlarına görə Füzuli müəllim Moskvadan "Bədii özfəaliyyətdəki uğurlarına görə" döş nişanı ilə təltif edilib.

Azərbaycan Dövlət Gənc Tamaşaçılar Teatrında M.Təhmasibin "Rübailər aləmində" əsərinin tamaşası ilə bağlı müzakirədə etdiyi çıxış Füzuli müəllimin həyatının dönüş nöqtəsi oldu. Mərhum professor Xeyrulla Məmmədovun məsləhəti ilə müzakirəyə qatılan F.Əsgərli orada tənqidi məzmunlu, sağlam düşüncəli çıxışı ilə iştirakçıların, o cümlədən xeyirxah insan, gözəl alim, pedaqoq-tənqidçi Əhəd Hüseynovun diqqətini cəlb etdi. Əhəd müəllim onu elmə daha da həvəsləndirdi.

Həm elmi potensialına, həm də teatrdakı uğurlu fəaliyyətinə görə 1973-cü ildə Füzuli müəllimi ADPU-da işə qəbul edildi. O, elmi-publisistik, teatr və bədii tərcümə ilə bağlı daha intensiv fəaliyyətə başladı. Maraqlı tərcümələr edir, qəzet və jurnallar üçün publisistik və elmi məqalələr yazır, Azərbaycan radiosu və televizi- yası ilə mütəmadi əlaqə saxlayırdı. Xalq yazıçısı İsmayıl Şıxlı onun tərcümə yaradıcılığı ilə məşğul olduğunu bildikdə F.Əsgərlini bu işə həvəsləndirdi, tərcü- mənin nəzəri əsaslarını da öyrənməyi, bu istiqamətdə dissertasiya da yazmağa tövsiyə etdi. Bu tövsiyə öz səmərəsini verdi və yorulmaq bilmədən çalışan Füzuli mü- əllim səviyyəli bir dissertasiya yazdı, uğurla müdafiə edərək filologiya elmləri namizədi elmi dərəcəsi aldı. 1994-cü ildə isə Ədəbiyyat və onun tədrisi meto- dikası kafedrasına dosent vəzifəsinə seçildi, 1991-1997-ci illərdə Filologiya fakültəsində dekan müavini vəzifəsində çalışdı.

Füzuli müəllim Sovet dönəmində yeddi il institut və respublika üzrə tələbə inşaat dəstəsinin komandiri təyin edilmiş, təşkilatçılıq bacarığına, səmərəli fəaliy- yətinə görə bir sıra mükafatlarla, fəxri fərmanlarla təltif edilmişdir.

Pedaqoji işlə yanaşı, yorulmadan və həvəslə elmi istiqamətdə də fəaliyyətini davam etdirmiş, bu istiqamətdə uğurlar qazanmışdır. Onun uşaq ədəbiyyatına aid "Sənətkarın uşaq dünyası", "Azərbaycan uşaq ədəbiyyatının mərhələli inkişafı", "Ömrün zözü, sözün ömrü", "Uşaq ədəbiyyatı: qarşılıqlı yaradıcılıq qaynaqları", "Bədii təhlil və ədəbi tənqid", "Sehrli dünyanın memarı", "Bədii tərcümə prin- sipləri" adlı monoqrafiyaların, ali məktəblər üçün "Uşaq ədəbiyyatı" dərsliyinin, "Azərbaycan uşaq ədəbiyyatı", "Dünya uşaq ədəbiyyatı" dərs vəsaitinin, "Ədəbi düşüncələr", "Zahid Xəlilin sənət dünyası", "Problemlər, düşüncələr", "70 ilin işığında" məqalələr toplusunun müəllifidir.

F.Əsgərli Azərbaycanın ədəbi meydanının təcrübəli, peşakar və məhsuldar tərcüməçilərindən biridir. Bir sıra xalqların dəyərli ədəbiyyat nümunələrini milli dilimizə çevirərək Azərbaycan oxucusuna təqdim etmişdir. Onun mütərcim xəritəsi milli baxımdan rəngarəngdir. Moldav yazıçısı Filip Mironov, Litva dramaturqu Albertas Laurincükas, eston yazıçıları Anton Tammsaare, Raul Kuusberq, Andres Yaaksoo, türkmən yazıçısı Berdinəzər Xudayanəzərov, qazax yazıçısı Kaldarbay Naymanbayev, gürcü yazıçısı Nodar Dumbadze, rus yazıçıları Aleksey Tolstoy, Konstantin Sergeyenko, Aleksey Osipov, Nikolay Nosov, Yan Larri, norveç uşaq yazıçısı Anne Vestli və digər qələm sahiblərinin bir sıra bədii yaradıcılıq örnəkləri Füzuli müəllimin qələmi ilə ana dilimizə çevirmiş və nəşr edilmişdir.

O, 2009-cu ildə "Qızıl qələm" media mükafatı laureatı, 2010-cu ildə isə "İlin nüfuzlu ziyalısı" fəxri adına layiq görülmüşdür. Ədəbiyyatşünas alim 2010 və 2013-cü illərdə tədrisin keyfiyyətinin yaxşılaş- dırılması, tələbələrin tədris prosesinə daha fəal cəlb edilməsi, tələbələrin dərslik və dərs vəsaiti ilə təminatı, yeni təlim texnologiyalarının tətbiqi sahəsində qazandığı nailiyyətlərə görə humanitar və pedaqoji elmlər üzrə "İlin müəllimi" nominasiyasının qalibi olmuşdur. F.Əsgərli həm də gözəl, nümunəvi ailə başçısıdır. Böyük qızı Şəfa ADPU-nun Filologiya fakültəsini bitirib, hazırda "Azərbaycan ədəbiyyatı" ixtisası üzrə doktorantdır. Şəfa xanımın həyat yoldaşı Rasim dövlət qulluğunda məsul vəzifədədir. Füzuli müəllimin böyük oğlu Cavid Mərkəzi Bankın İnformatilka Texnologiya Depatamentində proqramçı kimi fəaliyyət göstərir. Kiçik oğlu Ceyhun isə filoloqdur, ingilis və rus dillərini mükəmməl bilir. Hər iki oğul övladının gözəl ailəsi var. Cavid Sevil xanımla, Ceyhun isə Lalə xanımla ailə qurub. 70 yaşlı alim beş nəvənin babasıdır: Rəmzi, Röya, Rəvan, İlkin və Kənan.

Ədəbiyyatşünas alim, tənqidçi, tərcüməçi və fədakar pedaqoq Füzuli Əsgərli indi ömür karvanının 70-ci ilinə qədəm qoymuşdur. Daha dəqiq desək, ömrün 70-ci baharı ərəfəsindədir. Biz Füzuli müəllimə möhkəm cansağlığı və elmi-pedaqoji fəaliyyətində yeni-yeni uğurlar arzulayırıq!

**Yaqub Babayev,**
**filologiya üzrə elmlər doktoru, dosent**

## Təhsil Nazirliyi SABAH qruplarına qəbulla bağlı müsabiqə keçirir

Təhsil Nazirliyi 2015-2016-cı tədris ili üçün SABAH qruplarına tələbə qəbulu üzrə müsabiqə keçirir.

Müsabiqədə ölkəmizdəki bütün ali təhsil müəssisələrinin bakalavr pilləsində I kursda əyani təhsil alan və orta akademik göstəricisi 61 baldan yüksək olan tələbələr iştirak edə bilər.

SABAH qruplarında oxumaq istəyən tələbələrin qeydiyyatı artıq başlayıb. www.sabah.edu.az saytında yerləşdirilmiş elektron ərizə formasını doldurmaqla tələbələr müsabiqəyə qoşula bilərlər.

6 ixtisas qrupuna (təbiət, təhsil, iqtisadiyyat, humanitar, texniki, mədəniyyət) daxil olan 64 ixtisas üzrə təşkil olunan müsabiqə 3 mərhələdə aparılacaq. İlkin mərhələdə tələbələrin akademik göstəriciləri qiymətləndiriləcək. İkinci mərhələdə tələbələr ingilis dili və məntiq üzrə test imtahanı verəcəklər. Bu prosesləri uğurla keçən namizədlər müsahibəyə dəvət olunacaqlar.

# SABAH qrupları ilə bağlı I tədris ili tələbələri ilə görüş

Məlum olduğu kimi, respublikamızda 2015-2016-cı tədris ili üçün SABAH qruplarına tələbələrin yerləşdirilməsinə başlanılıb. Bununla əlaqədar olaraq fevral ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük zalında SABAH qruplarına tələbələrin yerləşdirilməsi ilə bağlı təbliğat proqramı çərçivəsində I tədris ili tələbələri ilə görüş keçirilib. Görüşdə Təhsil Nazirliyinin SABAH qruplarının İcra Komitəsinin rəhbəri Elçin Ağakişiyev, ADPU-da SABAH qruplarının koordinator-rəhbəri Lalə Mürsəlbəyova iştirak ediblər. Görüşdə çıxış edən Elçin Ağakişiyev SABAH qrupları barədə ətraflı məlumat verərək bildirib ki, bu qrupların yaradılması ideyası Təhsil naziri cənab Mikayıl Cabbarova məxsusdur. Təhsil naziri Mikayıl Cabbarov bu təşəbbüs barədə fikirlərini ilk dəfə 2013-cü ilin payızında keçirilmiş mötəbər tədbirlərin birində səsləndirib. Azərbaycan müəllimlərinin XIV qurultayındakı geniş məruzəsində isə nazir növbəti tədris ilindən başlayaraq ali təhsil müəssisələri üzrə SABAH qruplarının təşkili üçün seçim aparılmasının nəzərdə tutulduğunu təhsilin bütün pillələri üzrə nümayəndələrin iştirak etdiyi qurultayın mötəbər tribunasından bir daha bəyan edib və bundan sonra yeni layihənin tətbiqi yönündə işlərə start verilib. 2014-cü il fevral ayının 13-də "Hyatt Regency" otelində Təhsil Nazirliyinin tabeliyindəki ali təhsil müəssisələrində yaradılacaq SABAH qruplarının rəsmi təqdimatı olub.Sonra SABAH qruplarına tələbələrin qəbulu qaydaları işlənib hazırlanıb və təsdiq olunub.





E.Ağakişiyev çıxışında qeyd edib ki, SABAH qruplarının yaradılmasında əsas məqsəd ali təhsildə təhsilin keyfiyyətinin yüksəldilməsi, müasir tələblərə uyğun kadr hazırlığının təmin edilməsi və ali təhsil sistemində yeni mühitin yaradılmasıdır. SABAH qrupları Təhsil Nazirliyinin tabeliyindəki ali təhsil müəssisələrində Savadlı, Bacarıqlı və Hazırlıqlı (SABAH) tələbələrdən ibarət qruplar zənciridir. SABAH ali təhsil sisteminin yeni inkişaf istiqaməti üzrə layihədir. Bu layihənin əsas məqsədi ali təhsil sahəsində davamlı, uzunmüddətli, hərtərəfli və əhatəli keyfiyyət dəyişikliklərinin həyata keçirilməsi üçün zəruri mühitin yaradılmasıdır. SABAH qruplarının hədəflərinə gəldikdə isə E.Ağakişiyev bildirib ki, bu, təhsildə innovativ tədris metodikaların tətbiqi, təhsilverənlərin inkişafı və stimullaşdırılması, təhsil mühitinin dəyişdirilməsi və yenilənməsi, akademik və biznes mühitlərinin əlaqələrinin genişləndirilməsi və inteqrasiyası kimi prinsipləri özündə ehtiva edir.

SABAH qruplarının baza ali təhsil müəssisələri Bakı Dövlət Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti, Azərbaycan Dövlət Neft Akademiyası, Azərbaycan Memarlıq və İnşaat Universiteti, Azərbaycan Texniki Universiteti, Azərbaycan Dövlət Pedaqoji Universiteti və Azərbaycan Dillər Universitetidir. Bu qrupların sahələri təhsil ixtisasları, humanitar və sosial ixtisaslar, iqtisadiyyat və idarəetmə ixtisasları, təbiət ixtisasları, texniki və texnoloji ixtisaslardır.

SABAH qruplarının aşağıdakı tələbləri var: 3 mərhələli seçim müsabiqəsindən keçmək, birinci tədris ilini müvəffəqiyyətlə bitirmək. Seçilmiş tələbələrin ümumi sayı 700 nəfər, ixtisasların ümumi sayı isə 33-dür.

Qeyd edək ki, SAHAH qrupları sürətlə inkişaf edən iqtisadiyyatın tələblərinə uyğun yüksəkixtisaslı mütəxəssislərin yetişdirilməsinə, mövcud proqramların təkmilləşdirilməsinə və əmək bazarının tələblərinə uyğunlaşdırılmasına, ali təhsil sahəsində dünyanın aparıcı universitetləri ilə əməkdaşlıq layihələrinin həyata keçirlməsinə, elmi-tədqiqat, təcrübə və tələbə mübadilələrinin genişləndirilməsinə imkan yaradır. Bir sözlə, SABAH qrupları Azərbaycan gənclərinin fərdi və peşəkar inkişafına dəstək verilməsində yeni imkanlar açır.

İxtisas üzrə kompetensiyalara tam yiyələnmə, SABAH qruplarının bütün tələbələri üçün əlavə təqaüd, ödənişsiz yataqxana və gündə 3 dəfə yemək, xarici mübadilə proqramları, intellektual və yaradıcılıq potensialının inkişafı, tədrisin təşkilində mütərəqqi forma və metodlar, müasir müəssisə və şirkətlərdə tədris və istehsalat təcrübələri, əmək bazarının tələblərini tam qarşılamaq SABAH qruplarının üstünlükləridir. Bu qruplarda dərs demək üçün yerli baza ali təhsil müəssisələrinin müəllimlərindən yeni və müasir tədris metodikasını bilmək, elmi-tədqiqat və konsaltinq təcrübəsi, peşəkarlıq və müsbət reputasiya, müasir düşüncə və geniş dünyagörüşü, həmçinin ATM-də iş təcrübəsi və British Council sertifikatına malik olmaq tələb olunur. Xaricdən isə SABAH qruplarında Qərb universitetlərinin yüksək akademik və tədris təcrübəsinə malik olan müəllimləri, sənaye və müəssisə nümayəndələri dərs deyə bilərlər.

Görüşdə tələbə-gənclərin çoxsaylı sualları cavablandırılıb.

**"Gənc müəllim"**

# Əməkdaşlarımız beynəlxalq simpoziumda

Bu yaxınlarda Qırğızıstan Respublikasında Türk dünyasının böyük mütəfəkkiri İsmayıl bəy Qaspıralının anadan olmasının yüzüncü ildönümünə həsr olunmuş "Qaspıralı Ismayıl bəyin ölümünün yüzüncü ilində dildə, fikirdə, işdə, birlikdə haradayıq?" adlı beynəlxalq simpozium keçirilmişdir. Adıçəkilən simpozium İstanbul Türk Ocaqları Birliyi, Qırğızıstan-Türkiyə Manas Universiteti və Türkiyə Əməkdaşlıq və İnkişaf Idarəsinin (TİKA) birgə təşkilatçılığı ilə Qırğızıstanın paytaxtı Bişkek şəhərində keçirilmişdir. Simpoziumun açılışı bir sıra mötəbər qonaqların çıxışları ilə yaddaqalan olmuşdur. Tədbiri giriş sözü ilə Qırğızıstan-Türkiyə Manas Universitetinin rektoru, professor Sebahattin Balcı açaraq tədbir iştirakçılarına uğurlar arzuladı.



Daha sonra Qırğızıstan-Türkiyə Manas Universitetinin rektor vəkili, professor Asılbek Kulmırzayev çıxış edərək konfrans iştirakçılarını təbrik etdi. Sonra isə Türkiyə Respublikası Baş Nazirinin müavini, professor Numan Kurtulmuş çıxış etdi. Professor Numan Kurtulmuş da öz növbəsində belə bir mötəbər tədbirin keçirilməsi üçün minnətdarlığını bildirdi və konfransın gedişinə uğurlar arzuladı. Bundan sonra isə İstanbul Türk Ocaqları Birliyinin başçısı Cezmi Bayram və İstanbul Universitetinin prorektoru, professor Sedat Murat çıxış edərək tədbir iştirakçılarına müvəffəqiyyətlər arzuladılar. Açılış tədbirindən sonra simpozium bölmə iclasları şəklində davam etdi.



"Qaspıralı Ismayıl bəyin ölümünün yüzüncü ilində dildə, fikirdə, işdə, birlikdə haradayıq?" adlı beynəlxalq simpoziumda Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) "Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının müdiri, professor Elman Quliyev və həmin laboratoriyanın elmi işçisi Leyla Kərimova təmsil etmişlər. Professor Elman Quliyev "Qaspıralı Ismayıl bəyin əsərlərində qadın mövzusu", Leyla Kərimova isə "Qaspıralı Ismayıl bəyin dildə, fikirdə, işdə birlik ideologiyasının Mehmet Akif Ersoy əsərlərinə təsiri" adlı məruzələrlə çıxış etmişlər. Onların hər ikisinin çıxışı bəyənilmiş və əməkdaşlarımız sertifikat ilə təltif olunmuşlar.

Biz də onları bu uğurları münasibətilə təbrik edir, yeni-yeni uğurlar arzulayırıq.

**Aytən ABBASOVA,**
**"Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının elmi işçisi**

# Tarix fakültəsinin tələbələri pedaqoji təcrübədə

Fevral ayının 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin(ADPU) Tarix fakültəsinin qiyabi şöbəsinin Bakı Slavyan Universitetinin (BSU) Məktəb-Lisey Kompleksində pedaqoji təcrübə keçən IV kurs tələbələrinin Azərbaycanın Milli Qəhrəmanı Mübariz İbrahimovun doğum gün münasibətilə "Mübarizləri olan Vətən basılmaz" adlı anım tədbiri keçirildi. Tədbirə Məktəb-Lisey Kompleksinin rəhbərliyi və yuxarı sinif şagirdləri iştirak etmişlər.



Tədbir Azərbaycanın Dövlət Himninin səslənməsi ilə başlandı.Tədbirin əvvəlində şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edildi. Giriş sözü ilə çıxış edən məktəbin təşkilati işləri üzrə direktor müavini Naibə xanım xalqımızın igid oğlu Mübariz İbrahimovun göstərdiyi şücaətlərdən danışdı. Tədbir məktəblilərin ifasında Mübariz İbrahimovun əziz xatirəsinə həsr olunmuş bədii kompozisiya ilə davam etdirildi.

Məktəb-Lisey Kompleksinin 9-cu sinif şagirdləri Qəmər Quliyeva və Elman Əsədov qeyd ediblər ki, bu gün adı dillər əzbəri olan, haqqında kitablar, şeirlər, mahnılar yazılan, filmlər çəkilən Azərbaycanın Milli Qəhrəmanı Mübariz İbrahimovun yüksəldiyi zirvə təkcə onun doğulub boya-başa çatdığı kənddən deyil, Azərbaycanın və eləcə də bütün Türk dünyasının hər yerindən görünür.

Bu zirvəyə gedən yol isə Biləsuvar rayonunun Əliabad kəndindən başlanır. Mübariz İbrahimov 1988-ci il fevralın 7-də bu məkanda dünyaya göz açmışdır. Elə həmin il erməni işğalçıları Vətənimizin ayrılmaz hissəsi olan Qarabağ bölgəsində torpaq iddiası ilə münaqişə yaratmağa başlamışdılar. Bəlkə də Allah-Taala Mübariz İbrahimovu bu yağı düşmənlə gələcəkdə mübarizə aparacaq bir oğul kimi dünyaya gətirmişdi. Ailənin üçüncü övladı - sonbeşiyi, seyid nəvəsi idi Mübariz.O, uşaqlıqdan imanlı, bütün insani keyfiyyətlərə malik valideynləri - atası Ağakərim kişinin, anası Şamama xalanın nümunəvi tərbiyəsi ilə böyümüşdü. Vətənə, xalqa, haqqa, ədalətə son dərəcə sadiq ruhda tərbiyə alan Mübariz 2006-cı ildə Malik Piriyev adına Əliabad kənd orta məktəbini bitirmişdi. 2007-ci ildə isə həqiqi hərbi xidmətini Daxili İşlər Nazirliyinin Daxili Qoşunlarının xüsusi təyinatlı dəstəsində gizir rütbəsi ilə başa çatdırmışdı. Sonra isə erməni işğalçılarından intiqam almaq üçün könüllü olaraq yenidən Azərbaycan Silahlı Qüvvələrində xidmət etmək üçün ərizə ilə müraciət edərək Vətənin müdafiəsinə yollanıb.

**(Davamı 8-ci səhifədə)**

# "Gülüstan" Sarayında 2 Fevral -Gənclər Gününə həsr olunmuş bayram tədbiri keçirilib

Yanvar ayının 30-da "Gülüstan" Sarayında 2 Fevral-Gənclər Gününə həsr olunmuş bayram tədbiri keçirilib. Tədbirdə çıxış edən Səbail Rayon İcra Hakimiyyətinin (RİH) başçısı Asif Əsgərov bildirib ki, müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ulu öndər Heydər Əliyev həmişə Azərbaycan gəncliyini hər mənada savadlı, bilikli, güclü görmək istəyirdi. Xalqın, millətin yaşaması və inkişafı üçün gəncliyin sağlam və vətənpərvər ruhda tərbiyə olunması çox vacibdir. Yetişməkdə olan nəsil sağlam təfəkkürlü, kreativ düşüncə tərzinə malik olmalıdır.



Məlumat üçün bildirək ki, tədbirdə rayonun ictimai-siyasi həyatında, təhsildə, idmanda, elm, mədəniyyət və digər sahələrində fərqlənən, ümumilikdə 20 nominasiya üzrə gəncə və gənc kollektivə Səbail RİH-in fəxri fərmanları və qiymətli hədiyyələri təqdim olunub.

Qeyd edək ki, bu mərasimdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Gənclər Təşkilatının sədri Sahil Qələndərov "Ən fəal təşkilatçı" nominasiyası üzrə mükafata layiq görülüb.

Biz də Sahil Qələndərovu bu mükafata layiq görülməsi münasibətilə təbrik edir, ona yeni-yeni uğurlar arzulayırıq!

**Mətbuat və informasiya şöbəsi**

# Tarix fakültəsinin tələbələri pedaqoji təcrübədə

(Əvvəli 7-ci səhifədə)

O, Azərbaycanın ərazi bütövlüyü uğrunda qəhrəmancasına həlak olmuşdur.

Tədbirdə Çinarə Kazımova, Nurlan Nağıyev, Fərid Qasımov, Rəsul Cəfərov, Sevda Dadaşova, Solmaz Məlikova Mübariz İbrahimova həsr olunmuş şeirlər söylədilər. Gülgəz Bağırova, Musa Mirzəyev, Fərrux İsmayılzadə, Ziyarət Becanova xalqımızın cəsur və vətənpərvər oğlu Mübariz İbrahimovun keçdiyi həyat yolundan onun mübarizliyindən, vətənpərvərliyindən, şücaətindən danışdılar. Səkinə Xamtayeva, Aytac Ağazadə,



Nurlan Nağıyevin və Ziyarət Becanovanın ifasında isə "Cənab leytenat"mahnısı səsləndi. Sonra isə Mübariz obrazını canlandıran Saleh hər kəsi qəhərləndirdi. Sonra yenidən Mübariz İbrahimova həsr olunmuş şeirləri ilə məktəbin şagirdləri Loğman, Xəyalə, Kamran, Samir ürəklərində Mübarizə olan sevgini hər kəsə bəyan etdilər. Musa Mirzəyev isə "Ümid sənədir ancaq, Azərbaycan əsgəri!" şeirləri ilə əsgərlərimizə sonsuz inamımızın olduğunu vurğuladı.

Tədbirdə şagirdlər Mübariz İbrahimov kimi vətənpərvər olacaqlarına, təhsildə, ictimai həyatda daim uğurlar qazanacaqlarına and içiblər. Sonra Mübariz İbrahimova həsr olunmuş klip çarxı nümayiş olunub. Daha sonra Məktəb-Lisey Kompleksinin direktoru İlahə Carçıyeva çıxış edərək Mübariz İbrahimovun şərəfli həyat yoluna nəzər salaraq bütün Azərbaycan gənclərini onun kimi qeyrətli, igid və vətənpərvər olmağa səslədi.

Qeyd edək ki, pedaqoji təcrübə keçdiyimiz müddətdə ADPU üzrə Pedaqoji təcrübə rəhbəri, dosent Xankişi Məmmədov, Tarix fakültəsi üzrə Pedaqoji təcrübə rəhbəri,dosent Tahir İsgəndərov və Pedaqoji təcrübə rəhbəri, dosent Elmira Qasımova bizə xüsusi qayğı və diqqətlə yanaşmış, pedaqoji təcrübəmizin yüksək səviyyədə keçməsi üçün lazımi köməklik göstərmişlər.

**Fatimə Eyvazova,**
**Mehriban Bədəlova**
**Tarix fakültəsinin**
**IV kurs tələbələri**

# KİTABXANAMIZ ZƏNGİNLƏŞİR

1. İlham Əliyev. "İnkişaf-məqsədimizdir". B., "Azərnəşr", 2014, 424 səh.

Kitabda Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ölkəmizdə ətraf mühitin mühafizəsi, regionların sosial-iqtisadi inkişafı, gənc nəslin milli-mənəvi dəyərlərə bağlılığı və intellektual səviyyəsinin yüksəldilməsi, idmanımızın dünya səviyyəsində inkişafı, eyni zamanda ictimai-siyasi həyatın digər məsələlərinə həsr olunmuş çıxış və nitqləri geniş yer tutmuşdur.

2. Ramiz Mehdiyev. "Ermənilərin mif yaradıcılığı tarixdə ilk xristian dövləti kontekstində". B., "Şərq-Qərb", 2014, 80 səh.

3. Fərrux Rüstəmov. "Azərbaycanda təhsil və tərbiyə nəzəriyyəsinin inkişafı (1961-1981-ci illər)" B., "Elm və təhsil", 2011, 136 səh.

Kitabda XX əsrin 60-70-ci illərində Azərbaycanda pedaqoji elmin inkişafının əsas istiqamətləri açıqlanır, pedaqoji elmin inkişafına təsir göstərən amillər səciyyələndirilir.

4. Yan Amos Komenski. "Böyük didaktika." B., "Elm və təhsil", 2012, 388 səh.

Bu kitab nəşrə hazırlanarkən Y.A.Komenskinin 1961-ci ildə Bakıda nəşr olunmuş "Seçilmiş pedaqoji əsərləri"ndən istifadə olunmuşdur.

5. Azərbaycan Milli Elmlər Akademiyası Milli Azərbaycan Tarixi Muzeyi. "Azərbaycanın neft salnaməsi". Kataloq. B., 2014, 253 səh.

Kataloq Milli Azərbaycan Tarixi Muzeyinin fondlarında qorunan və Azərbaycan neftinin tarixini əks etdirən materiallar əsasında hazırlanıb. Kataloqda yer alan fotoşəkillər, şəxsi təltiflər, sənədlərin əsilləri, texniki avadanlıq, əmək alətləri və s. eksponatların əksəriyyəti unikaldır və yalnız Milli Azərbaycan Tarixi Muzeyinin kolleksiyasında saxlanılır.

6. Azərbaycan Milli Elmlər Akademiyası Milli Azərbaycan Tarixi Muzeyi. "Azərbaycan Birinci Dünya müharibəsi dövründə". Elmi məqalələr toplusu. B., "Ziya", 2014, 208 səh.

7. Azərbaycan Milli Elmlər Akademiyası Milli Azərbaycan Tarixi Muzeyi. "Dost ellərin hədiyyələri (Milli Azərbaycan Tarixi Muzeyinin materialları əsasında)". Kataloq. B., "Ziya", 2014, 172 səh.

8. Artur Miller. "Seçilmiş əsərləri". B., "Şərq-Qərb", 2013, 728 səh.

9. Haynrix Mann. "Seçilmiş əsərləri". B., "Şərq-Qərb", 2013, 568 səh.

10.Səxavət Əliyeva. "Yeniyetmə aqressiyasının psixoloji xüsusiyyətləri". Monoqrafiya.B., "Avropa" nəşriyyatı, 2014, 162 səh.

Monoqrafiyada aqressiya və aqressivlik fenomeni hərtərəfli tədqiq edilmiş, aqressiv davranışın mahiyyətini açmağa yönəlmiş psixoloji nəzəriyyələr araşdırılmış, aqressiv davranışa səbəb olan bir çox sosial-psixoloji faktorlar öyrənilmişdir.

11. N.Ə.Əkbərov, R.K.Məmmədova. "Üzvi sintez (nümunələr, mühüm reaksiyalar, çalışmalar)". Dərs vəsaiti. B., 2014, 282 səh.

Təqdim olunan bu dərs vəsaiti "Üzvi sintez" fənninin əsas prinsiplərini, planlı üzvi sintezin bəzi nümunələrini, üzvi sintezdə geniş istifadə olunan bir çox mühüm birmərhə-ləli üzvi reaksiyaların qısa və yığcam izahını və bir çox bölmələr üzrə çalışmaları, sual və tapşırıqları özündə əks etdirir.

12.Vurğun Məmmədov. "Azərbaycan Etnoqrafiyası" (Ü.Hacıbəyli və Ə.Haqverdiyevin əsərləri əsasında). Dərs vəsaiti. B., "ADPU", 2014, 164 səh.

Dərs vəsaiti Ü.Hacıbəyli və Ə.Haqverdiyevin etnoqrafik irsinə həsr olunmuş ilk təşəbbüsdür. Burada ilk dəfə olaraq sözügedən müəlliflərin əsərlərində yaşadığı dövrün tarixi-etnoqrafik xarakteristikası verilir.

13. Hüseynov Əli, Mirzəyeva Aynur. "Biologiyanın tədrisində müasir təlim metodlarının tətbiqi" (Metodik vəsait). B., 2014, 96 səh.

Metodik vəsaitdən orta məktəbin X-XI siniflərində ümumi biologiya kursunun tədri-sində müasir təlim metodlarından istifadənin imkan və yolları tədqiq olunur.

14.Təranə Məhəmməd qızı Əzimova. "Anar dramaturgiyasında psixologizm". B., "ADPU", 2014, 166 səh.

15. Akif Əliyev. "Latın dili" (Dərslik). B., 2014, 317 səh.

Dərslik baytarlıq və əczaçılıq ixtisasları üzrə ali təhsilin bakalavriat və magistratura pilləsində təhsil alan tələbələr üçün nəzərdə tutulmuşdur.

16. Azərbaycan Respublikası Nazirlər Kabineti yanında "İçərişəhər" Dövlət Tarixi-Memarlıq Qoruğu İdarəsi Elmi-Mədəni Mərkəz.

"Şərqdə İlk Demokratik Respublika". (28 May-Respublika Günü ilə əlaqədar elmi-praktik konfrans). Məqalələr toplusu. B., "Elm və təhsil", 2014, 224 səh.

17. Mixail Şoloxov. "Seçilmiş əsərləri". B., "Şərq-Qərb", 2013, 424 səh.

18 .Sona Hüseynağa qızı İmanova. "Torpaqların ekologiyası və mühafizəsi yolları" (Abşeron yarımadası timsalında) . B., "ADPU", 2014, 173 səh.

19. Əliyeva Tinatin Məhəmməd qızı. "Ali pedaqoji məktəblərin riyaziyyat fakültələ-rində riyaziyyatın tədrisi metodikası və riyazi fənlər arasındakı əlaqələrin reallaşdırılması problemləri". "ADPU", 2013, 278 səh.

Dərs vəsaitində respublikamızda son illərdə irəli sürülmüş təhsil konsepsiyasının həyata keçirilməsi istiqamətində tədqiq olunmuş tədris-metodik işlər və onların tətbiqlə-rinin nəticələri əks olunmuş və ali pedaqoji məktəblərdə riyaziyyat müəllimlərinin elmi və peşə hazırlığı fənlərarası əlaqələr mövqeyində işlənmişdir.

20. Dünyabəyim Əfəndiyeva, Dürdanə Ələsgərova. "Diyarşünaslıq" (Ali məktəbin magistr və bakalavr pilləsi üçün). B., "ADPU", 2014, 65 səh.

21. Rüstəm Kamal. "Kitabi-Dədə Qorqud": nitq janrları və davranış poetikası. B., "Nurlan", 2013, 148 səh.

Tanınmış ədəbiyyatşünas Rüstəm Kamalın bu kitabı Türkün ulu abidəsi "Kitabi-Dədə Qorqud"da davranış poetikasına həsr olunmuşdur.

22. "Türk xalqları folkloru". III kitab. Özbək xalq şeirindən seçmələr. B., "Elm və təhsil", 2014, 172 səh.

Kitab "Türk xalqları folkloru"seriyasının növbəti toplusudur.Topluda zəngin şifahi ənənələrə malik olan özbək xalq şeirinin müxtəlif janrlarına (xalq mahnıları, yar-yarlar, əmək nəğmələri, laylalar və ağılar)mənsub seçmə nümunələr öz əksini tapmışdır. Örnəklər Azərbaycan dilində ilk dəfə nəşr olunur.

23. Fəridə Səfərəliyeva (Əliyeva). "Uşaq folkloru və şagirdlərin bədii təfəkkürünün inkişaf etdirilməsi" (Dərs vəsaiti). "ADPU", 2014, 114 səh.

24. Həsənağa Ramazanlı. "Geocoğrafi, tarixi-arxeoloji dövrlərdə Şimali Azərbaycan-da fayans istehsalı texnotexnogenez problemlərinin mənşəyi məsələləri" (Elmi-nəzəri monoqrafiya). B., "Elm", 2014, 188 səh.

Şimali Azərbaycan ərazisində aşkar edilən istehsal alət və vəsaitləri indiyədək fundamental elmi-nəzəri tədqiqat obyekti olmamışdır. Məsələnin ayrı-ayrı prinsipləri elmi tədqiqat əsərlərində, dissertasiyalarında və kütləvi informasiya xarakterli ədəbiyyatda araşdırılmışdır.

25. Tofiq Hacıyev. "Dədə Qorqud kitabı": tariximizin ilk yazılı dərsliyi. B., "Elm və təhsil", 2014, 344 səh.

26. Əsməd Muxtarova. "Türk xalqlarının tarixi" (qədim dövr və orta əsrlər).Ali məktəblər üçün dərslik. B., "Adiloğlu"nəşriyyatı, 2013 , 446 səh.

27. "Dünya folklorşünaslığı", I kitab.C.F.Birlayn. Paralel mifologiya (Rus dilindən tərcümə edən K.Hüseynoğlu). B., "Elm və təhsil", 2014, 324 səh.

Kitaba nəinki bizim oxuculara kifayət qədər yaxşı tanış olan qədim və Yunan-Skandinav mifləri, həmçinin Afrika, Şimali və Cənubi Amerika, Asiya və Okeaniya xalqlarının mifləri də daxil edilib.

28. A.R.Buniyatov, Ə.Q.Pələngov. "Süni intellekt və ekspert sistemləri".(Dərs vəsaiti). B., "ADPU", 2014, 118 səh.

29. A.R.Buniyatov. "Kompüter riyaziyyatının tədrisi metodikası". (Dərs vəsaiti). B., "ADPU", 2014, 160 səh.

30. Mübariz Binnətoğlu. "Mənəviyyat zirvəsi". B., 2014, 271 səh.

Kitabda Azərbaycanın idman şərəfini əzmlə qoruyub yaşadan, mənəviyyat dolu bir ömür yaşamış İnqilab Əliş oğlu Novruzovun şərəfli və mənalı həyat yolundan və onun haqqında danışılan xatirələrdən bəhs edir.

31. "Rus nəsri antologiyası". B., "Şərq-Qərb", 2013, 368 səh.

32. Məcid İsmixanov, Rəfiqə Bəxtiyarova. "Ali məktəb pedaqogikası". (Mühazirə kursu). B., "ADPU", 2014, 236 səh.

"Mühazirə kursu"nda ali məktəb pedaqogikasının əsas problemləri şərh olunur.

33. Z.M.Kərimova, G.V.Sultanova, G.T.Eminova. "Pedaqogika" (Bakalavriar və magistrarura təhsili alan tələbələr üçün pedaqogikadan praktik dərs vəsaiti). B., "ADPU", 2014, 155 səh.

34. Aytən Mehdiyeva. "Orta əsrlər tarixi (V-XV əsrlər)". Əlavə vəsait. I hissə. B., "ADPU", 2014, 476 səh.

Orta əsrlər tarixi Ümumdünya tarixinin mühüm bir hissəsi olmaqla Avropa, Asiya və Amerika xalqlarının keçmiş tarixinə aydınlıq gətirir.

35. Nailə Hüseynova. "Loqopedik atlas". (Dərs vəsaiti). B., "ADPU", 2014, 115 səh.

36. Şərq cəmiyyətləri: ənənə və müasirlik.MDB ölkələri gənc şərqşünaslarının II qu-rultayının materialları (rus dilində). 11-14 noyabr 2013, 693 səh.

37. Araz Qurbanov. "Damğalar, rəmzlər, mənimsəmələr". B., 2013, 327 səh.

38. N.A.Verdizadə, Ə.Z.Zalov, K.Ə.Quliyev, N.A.Novruzova, N.Q.Məmmədova. "Qravi-metrik analiz" (ali təhsilin bakalavriat səviyyəsi üçün dərs vəsaiti). B., 2013, 157 səh.

Analitik kimya maddələrin vəsfi və miqdarı tərkibini öyrənən elmdir.

39. Məmmədəli Hənnan oğlu Ağayev. "Azərbaycan klassik irsində təhsil məsələləri". (Mühazirə xülasələri). Dərs vəsaiti. B., "ADPU", 2014, 174 səh.

"Azərbaycan klassik irsində təhsil məsələləri" adlı dərs vəsaitində Azərbaycan məktəb və pedaqoji irsində tərbiyə və təhsilin ilkin xarakterik əlamətləri, yazı və əlifbanın əhəmiyyəti, Azərbaycanda zərdüştlüyün yaranması və inkişafı, İslamiyyətin pedaqoji irsimizdə rolu və b.məsələlərə yer verilmişdir.

40. Müdafiə Mahmudov. "Dünyada təhsil sistemləri" (Monoqrafiya).B., "Mütərcim", 2014, 480 səh.

Kitabda inkişaf etmiş dünya ölkələrinin təhsil sistemi ilə bağlı müxtəlif istiqamətlərdə aparılmış araşdırmalar əksini tapmışdır.

41. Allahverdi Hacıyev, Tamam Mehrabova. "Müasir Azərbaycan dili" (mühazirə mətnləri). Dərs vəsaiti. B., 2014, 367 səh.

Dərs vəsaiti mühazirə mətnləri formasında Pedaqogika və psixologiya və Pedaqoji fakültələrin müasir Azərbaycan dili haqqında ümumi məlumat, Azərbaycan dilinin fonetikası, orfoqrafiyası və orfoepiyası, frazeologiyası, morfologiyası və sintaksisinə dair müəyyən həcmdə məlumat verilmişdir.

42. Əzizxan Tanrıverdi. "Dədə sözü işığında". B., "Elm və təhsil", 2014, 232 səh.

Kitabda işlənmiş qohumluq terminləri tarixi-linqvistik müstəvidə tədqiq edilir.

43. Национальная Академия Наук Азербайджана Национальный Музей Истории Азербайджана. "Нефтяная летопись Азербайджана."Каталог. Баку, 2014, 259стр.

44. Сабухи Ахмедов. "Азербайджанцы на фронтах Первой мировой войны": Татарский конный полк. Баку, "Зия", 2014, 246 стр.

45. Али Раджабли. "Монетное дело Азербайджанского Государства Сефевидов." Баку, "Зия", 2014, 232 стр.

46. Д.Б.Тагиев, А.Н.Мамедов. "Перспективные направления современной химии". Баку, "Элм", 2014, 328 стр.

47. Мамедова Дильбер Мамед кызы. "Истоки гармони в музыке устной традиции Азербайджана". Учебное пособие. Баку, "Аврора", 2014, 94 стр.

**Nüşabə Əmirəliyeva,**
**Elmi kitabxananın biblioqrafiya şöbəsinin müdiri**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi universitetin rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədova əzizi

**Bilal Səlimovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi universitetin rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədova əzizi

**Xurşud Bilalovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Kadrlar şöbəsinin müdiri Nigar Rəhimovaya dayısı

**Əzizağa Cabbarovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi tarix kafedrasının dosenti Nahidə Hacınskayaya qayınanası

**Cənnət xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının əməkdaşı

**Həqiqət Səlimovanın**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumtexniki fənlər kafedrasının baş müəllimi Əlirza Əyyubova bacısı

**Nərminə Əyyubovanın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 861
Sayı: 1500
Çapa imzalanıb: 28.02.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.